stansiyaları adlanır. Bu stansiyalarda enerji istehsal edən aqreqtın vahid gücü orta hesabla 3 - 1200 MVt həddində dəyişir. Elektrik enejisini uzaq məsafələrə ötrülməsi məqsədilə, 100 – 1200 kilovolt gərginlikli elektrk verilişi hava (bəzi hallarda kabel) xətlərindən istifadə olunur. Bununla yanaşı, elektrik enerjisinin uzaq məsafələrə ötrülməsi zamanı, xüsusilə müxtəlif ölkələrin elektroenergetika sistemləri arasında elektrik enerjisi mübadiləsini həyata keçirmək üçün, son illərdə yüksək gərginlikli sabit cərəyan qurğularından da geniş istifadə olunur.

*Enerji istehsalı texnolojiyalarına,* istifadə etdikləri ilkin enerji resurlarına və onların isitifadə sxemlərinə görə növbəti tip stansiyalar fərləndirilə bilər:

*Ənənəvi (bərpaolunmayan) enerji istehsalı texnolojiyaları*:

- Qazan - turbin elektrik stansiyaları (QTES);
  - ✓ kondensasiya tipli və ya dövlət rayon elektrik stansiyaları (KES və ya DRES);
  - ✓ istilik elektrik mərkəzləri (İEM);
- Qaz-turbin  qurğulu elektrik stansiyaları (QTQES);
- Buxar-qaz qurğulu (həmdövrəli) elektrik stansiyaları (BQQES);
- Porşenli mühərrik əsaslı (dizel) elektrik stansiyaları (DES);
- atom elektrik stansiyaları (AES);

*Qeyr-ənənəvi (bərpaolunan) enerji istehsalı texnolojiyaları:*

- hidroelektrik (su elektrik) stansiyalar (HES);
- günəş elektrik stansiyalrı (GES);
- külək elektrik stansiyaları (KES);
- geotermal istilik elektrik stansiyaları (GtİES) və s.

Bunlarla yanaşı, digər növ elektrik stansiyalarnı da qeyd etmək olar: daxili yanma mühərrikli elektrik stansiyalar (DYMES); bioenerji elektrik stansiyaları (BioES); qabarma

elektrik stansiyaları (QES); hidroakkumulyasiya elektrik stansiyaları (HAES) və s.

Qeyd edək ki, bərpaolunan enerji mənbələrindən istifadə edərək enerji istehsal edən stansiyaların elektrik enerjisinin istehsalındakı payı hələ ki, arzu olunan səviyyədə deyil - Beynəlxalq Bərpaolunan Enerji Agentliyinin (İRENA) məlumatına əsasən, BEM-nin elektrik enerjisi istehsalında payı 2020-cu ilin əvvəlinə orta hesabla 27% təşkil etmişdir.

*Avtonom enerji mənbələri* **- b**u qrupa az enerji tələb edən kiçik mühərrikli kommunikasiya, nəqliyyat, məişət, təsərrüfat, tədqiqat və laboratoriya profilli qurğuların qidalanması üçün nəzərdə tutulan enerji mənbələri daxildir. Bu cür enerji istehlakçılarına aşağıdakıları aid etmək olar: radio-televiziya aparatları, kompüterlər, əlaqə vasistələri, meteoroloji və seysmoloji stansiyalar, nəzarət-ölçü qurğuları, tibbi texnika, mürəkkəb oyuncaqlar və s.

Avtonom enerji mənbələrinə aşağıdakılar daxildir:

- dizel və ya benzinlə işləyən elektrik stansiyaları;
- məişətdə "batareya" və ya "daş" adlandırılan quru qalvonik elementlər;
- elektroakkumulyatorlar;
- günəş elektrik stansiyaları;
- külək elektrik stansiyaları;
- termoelektrik generatorlar (TEG);
- istilik elementləri və s.

Bu mənbələrin müxtəlif formaları və onların hər birinin praktiki əhəmiyyəti dayanmadan inkişaf etməkdədir. Beynəlxalq Energetika Agentliyinin (İEA) məlumatına əsasən, müasir dövrdə elektrik istehlakı balansında avtonom mənbələrdən istifadə olunma 5 % təşkil edir [8].

Bu cür elektrik mənbələrinin sayı milyard vahidlərlə ölçülür və onların ümüumi gücü yüz milyon kilovatdan artıqdır. Avtonom elektrik mənbələri o qədər intensiv şəkildə inkişaf edir ki, yaxın onillikdə bu mənbələrin enerji sistemindəki payının bir

neçə dəfə artması proqnozlaşla bilər. Bu, həm avtonom elektrik mənbələrinə tələbatın artması, həm də bu sistemlə bağlı yeni konsepsiyanın meydana çıxması nəticəsində baş verəcək. Belə mənbələr texniki baxımdan sürətlə təkmilləşir. Onların vahid gücü və enerji tutumu artır, əldə edilən enerjinin qiyməti isə sürətlə azalır. Bəzi hallarda avtonom enerji mənbələrindən istifadə olunması ümumi enerji şəbəkəsindən alınan elektrik enerjisindən istifadə etməkdən daha səmərəli və təhlükəsiz olur.

*Elektrik enerjisinin texnoloji mənbələri* - **b**ura maşın aqreqatının və texnoloji prosesin ayrılmaz hissəsi olan elektrik mənbələri daxildir. Məsələn, nəqliyyat vasitələrinin (təyyarənin, dizel qatarının, avtomobilin, gəmilərin və s.) elektrik generatorları, kosmik aparatların elektrik generatorları, hərəkət edən elektromexanizmlərin mənbələri (qaldırıcı kranlar, su nasosları, qaynaq aqreqatları, elektrokarlar və s.), hərbi texnikanın enerji mənbəyi və s. Belə elektrik mənbələrinin sayı milyadlarla ölçülür. Bu növ elektrik mənbələrinin funksiyaları texnoloji aqreqatların çərçivəsindən kənara çıxmır. Lakin, fövqəladə hallarda (təbii fəlakətlət, müharibə, pandemiya və s.) mülki ehtiyacların ödənilməsi – xəstəxanaların, yaşayış yerlərinin, çörəkxanaların, yeməkxanaların, sənaye tipli soyuducuların, radiostansiyaların, su təhcizatı stansiyalarının, su təmizləyici və s. qurğuların fasiləsiz işinin təmin edilməsi üçün texnoloji elektrik mənbələrindən geniş şəkildə istifadə olunur. Təsadüfi deyil ki, mülki müdafiə və fövqəladə hallar normalarına əsasən bu mənbələr müvafiq ərazinin ehtiyat elektrik mənbələri siyahısına daxil edilir.

Kitabın praktiki təyinatına uyğun olaraq, enerji istehsalı texnologiyalarının sadələşdirilmiş şəkildə təqdim olunduğunu nəzərə alaraq, daha geniş məlumatlar əldə etmək üçün digər texniki ədəbiyyatlara müraciət olunması zəruridir.

# FƏSİL IV

# ƏNƏNƏVİ (BƏRPA OLUNMAYAN) ENERJİ İSTEHSALI TEXNOLOJİYALARI

## 4.1. ƏNƏNƏVİ (BƏRPA OLUNMAYAN) ENERJİ MƏNBƏLƏRİ TARİXİNƏ QISA SƏYAHƏT

Buxar maşınlarının tarixi İngilis dəmirçisi Thomas Nyukomen və dostu kanalizasiya ustası Jon Koulinin 1705-ci ildə mədənlərdən suyu çəkmək üçün hazırladığı buxar nasosunun icad olunmasından başalayır. Sonradan, 1781-ci ildə İngilis ixtiraçısı və tədqiqatçısı Jeyms Uatt tərəfindən ixtira edilən və onun şərəfinnə Uatt buxar maşını adlandırılan qurğu *birinci sənaye inqilabını* şərtləndirmişdir. Bunun əsasında İngiltərə sənayenin inkişaf tempinə görə dünyada növbəti 200 il ərzində birinci yerdə olmuşdur. Doğrudur, daha dəqiq baxsaq, ilk dəfə buxarın gücündən istifadə edərək mexaniki işlərin görülməsi ilə bağlı məlumatlar 150 il b.e.ə məşhur Aleksandriyada (Misir) fəaliyyət göstərən dini, tədqiqat, təhsil və mədəniyyət müzeyində (yunan dilində "museyon" adlandırılırdı) çalışan Ktezibiem və Filamonun əsərlərində rast gəlinir. Buxar maşını orta hesabla 2 min il əvvəl Aleksandriyada doğulmuş yunan əsilli riyaziyyatçı - ixtiraçı Heron Aleksandrinus eolipilin (qədim yunanlara məlum olan buxar maşının ilk növü – Heron maşını – yunan dilindən "külək Allahı Eola şarı" kimi tərcümə olunur) icad etdiyi zaman başladığı məlum olur (*şəkil. 4.1*) [37].

Bəs ən qədim buxar maşını olan bu eolipil nə idi? Bu, öz oxu ətrafında dönə bilən bir kürə idi. Kürə, təzyiq altında

soplodan daxil olan buxarın təsirindən hərəkət edirdi. Soplolar biri-birindən əks istiqamətlərdə yerləşdirildiyinə görə firlanma momenti yaradırdılar. Məhz bu fırlanma momenti küreni öz oxu ətrafında fırlanmağa məcbur edirdi.

Buxar, şəkildən göründüyü kimi yarımkürənin içərisində onun altındakı yanacağın istiliyi ilə yaradılırdı. Heron buxar maşınının müasir prototipi dəqiqədə 1500 dövrə qədər sürətlənməyə qadirdir.




*Şək. 4.1. Heron Eolipili – Ən qədim buxar maşını [37].*

Qeyd edək ki, bu ixtira filosof, astronom və ixtiraçı Taki Al-Din tərəfindən buxar maşını yenidən ixtira olunan tarixə, 1577-ci ilə qədər tamamilə unudulmuşdur.

İxtiraçılar buxar maşınını israrla inkişaf etdirərək tezliklə ən geniş tətbiq olunan universal bir buxar maşınına çevirdilər. Təbii ki, elektrik generatorları üçün bir hərəkətverici intiqal zəruriyyəti yarandıqda, Uatt buxar mühərriyi dərhal tətbiq olundu. 1857-ci ildə mayaklarda güclü lampaları işıqlandırmaq

üçün 10 at gücü (7.36 kVt) olan kiçik bir buxar mühərriki ilə birlikdə işləyən ilk real "Alliance" elektrik generatoru fəaliyyət göstərməyə başladı. Bir neçə il ərzində yüzdən çox belə stansiya tikildi və ümumilikdə müştərək buxar mühərriyi olan elektrik generatorları (onların gücü yüz kilovatta çatdı) elektrik enerjisinin əsas istehsalçısına çevirildi.

Lakin, 1763-cü ildən başlayaraq Uatt Nyukomen buxar nasosunu təkmilləşdirərək 1776-cı ildə effektivliyi iki dəfə yüksək olan buxar maşınının patentini aldı (*şəkil 4.2*) [38]. Eyni zamanda, Uatt 6 il sonra iki təsirli buxar mühərriyinin başqa bir



*Şək. 4.2.Jeyms Uatt və onun buxar maşını. mənbə [38].*

növünü - buxar turbininin (Latınca "turbo" - "sürətli dönmə, vorteks") (artıq atmosfer təzyiqindən istifadə olunmayan – yalnız buxar silindirdəki porşeni hərəkətə gətirirdi) yeni növünü ixtira etdi. Hazırda, əksər hallarda turbin və generator güclü bir vahid kompleks hesab olunur, bunlara bir sözlə turbogenerator deyilir və qurğunun layihələndirilməsi eyni zamanda işlənilir.

Təqribən 100 il əvvəl buxar turbini öz əhəmiyyətini sübut etdi və o vaxtdan bəri elektrik stansiyalarında güclü elektrik generatorları üçün əsas hərəktətverici intiqal rolunu oynadı. Və

bir neçə onillikdən sonra elektrik stansiyalarında digər güclü qaz turbinlərinin tətbiqinə başlanıldı. Yeri gəlmişkən qeyd edək ki, hazırda Dünya üzrə istehsal olunan elektrik enerjisninin təqribən 70 %-i istilik elektrik stansiyalarında istehsal olunur [8].

Ənənəvi enerji istehsalı texnologiyalarının əsas istifadə olunan növləri növbəti paraqraflarda nəzərdən keçirilir.

## 4.2. İSTİLİK ELEKTRİK STANSİYALARI

*Elektrik stansiyası* – təbii enerjinin elektrik enerjisinə çevrilməsinə xidmət edən energetik qurğudur. Elektrik stansiyasının tipi hər şeydən əvvəl istifadə olunan təbii enerjinin növü ilə təyin olunur. Hazırda, istilik elektrik stansiyaları dünya ölkələrinin çoxunda istifadə olunan elektrik enerjisinin əsas mənbəyini təşkil etməkdədir. Dünyada istehsal olunan elektrik enerjisinin yarısından çoxu bu stansiyaların payına düşür. Eyni zamanda, "Enerdata" informasiya agentliyinin məlumatına əsasən, yalnız 10 ölkə istisna təşkil edir. O cümlədən, Fransada enerji istehsalının əsas hissəsi nüvə energetikasının payına düşür və ya Norveg və Yeni Zelendiyada elektrik enerjisinə olan ehtiyacın 80%-dən çox hissəsi BEM-in payına düşür [39].

İstilik elektrik stansiyalarının bir-neçə növü mövcuddur. Onları müxtəlif əlamətlərinə görə qruplaşdırmaq olar: ilkin istilik daşıyıcılarının növünə görə (buxar-turbin, qaz-turbin, buxar-qaz), əsas korpusun quraşdırılmasına görə (qapalı, yarımqapalı və açıq), işçi cisimlərin parametrlərinə görə (aşağı, orta, yüksək və kritik həddən yüksək ifrat təzyiqli), yandırılan yanacağın növünə görə və s. Buna baxmayaraq, çox hallarda bu stansiyaları ötürücü maşının növünə görə (qurğuya) fərqləndirirlər. Hal hazirda əsasən, aşağıdakı İES-lər fəaliyyət göstərir:

- buxar-turbin qurğulu – BTQ;
- buxar-qaz qurğulu – BQT;
- qaz-turbin qurğulu – QTQ;

- dizel – DES;
- qaz-porşen aqreqatlı – QPA;
- daxili yanma mühərrikli - DYM;
- Geotermal itilik elektrik stansiyaları – GtİES.

Hər bir İES-ın layihəsi həyata keçirilməsindən əvvəl layihə ilə əlaqədar və tənzimləyici təşkilatlarla – administrativ, təbiəti mühafizə, sanitar, yanğından mühafizə təşkilatı və s. ilə razılaşdırılmalıdır. Burada istilik elektrik stansiyanın baş planı vacib sənədlərdən biri hesab olunur. Bu sənəd elektrik stansiyasının ümumi xarakteristikasını göstərir və bu sahədə müvafiq təşkilatların suallara cavabı verilirr ki, bunlar da aşağıdakılardan ibarətdir:

- əsas avadanlığın seçimi;
- küləklərin əsas istiqamətləri;
- İES-ə yanacağın, yüklərin və heyətin daşınması ilə bağlı nəqliyyat sxemləri;
- İES qəsəbəsini və obyektlərinin daşqınlardan qorunması, stansiya obyektlərinin yerləşdirilməsi və s.

*Şəkil 4.3*-də İES-in enerji blokunun sadələşdirilmiş texnoloji sxemi göstərilib.

Bu sxemə əsasən İES-nın əsas və köməkçi avadanlıqları haqqında təsəvvür əldə etmək mümükündür.

Mərkəzi hissədə buxar generatoru (qazan qurğusu) yerləşir – bura yanacaq və hava qızdırıcıda (13) qızdırılmış hava verilir. Havanın verilməsi üçün (6) hava vurucudan istifadə edilir. İti buxar (12) buxar qızdırıcısından keçdikdən sonra əsas buxar xətti ilə (1) buxar turbininə daxil olur. (3) kondensatorunda yaranan kondensat (5) bəsləyici nasos vasitəsilə (10) su ekonomayzerindən keçərək qazan qurğusunun (8) barabanına verilir. Oradan endirici borular vasitəsilə soyuq su kollektoruna, sonradan qazan quğusunun ekran borularına daxil olaraq ocaqdakı yanma məhsullarının istiliyi hesabına qızdırılır və barabanda buxara çevrilir.Yanma nəticəsində

yaranan məhsullar (7) tüstüsoranın köməkliyi ilə tüstü qazlarının kənarlaşdırılması məqsədilə qurulan (11) tüstü borusuna atılır.




*Şək. 4.3. İES-in prinsipial texnoloji sxemi. 1 –buxar turbini; 2 – generator; 3 – kondensator; 4 – kondesatorun soyutma su nasosu; 5 – bəsləyici nasos; 6 – hava vurucu; 7 – tüstüsoran; 8 – baraban; 9 – enerji blokunun transformatoru; 10 – su ekonomayzeri; 11 – tüstü borusu; 12 – buxar qızdırıcı;13-hava qızdırıcı*

İstilik elektrik stansiyasının quruluşuna aşağıdakılar daxildir: yanacaq təsərrüfatı və yanacağın hazırlanması sistemi; qazanxana - qazan və köməkçi avadanlıqları; turbin qurğusu - turbin və köməkçi avadanlıqları; su hazırlığı və kondensat təmizləyici qurğu; texniki su təchizatı sistemi, kül çıxarma sistemi; elektrotexniki təsərrüfat; güc avadanlıqlarının idarəetmə sistemi.

İstilik elektrik stansiyaları arasında daha mürəkkəb və eyni zamanda ən geniş yayılmış olanı buxar turbinli elektrik stansiyalarıdır. Buxar-turbinli elektrik stansiyaları bir qayda

olaraq yüksək gücə malik olur və gücləri 100 - 4000 Meqavat hədlərində dəyişir. Nəhəng İES-lərdə sutkalıq kömür sərfiyyatı 20 min tona, mazut sərfiyyatı isə 10 min tona çatır (və ya bir-neçə yüz dəmiryol vaqonu). Bu qədər böyük müəssisənin bir sahədə fəaliyyət göstərməsi üçün kifayət qədər geniş ərazinin ayrılması tələb olunur (100 - 2000 hektar).

İstilik Elektrik Stansiyasının yaxınlığında (3-10 km) energetiklərin və inşaatçıların tərkibində sosial obyektlər olan kompleksi – məktəb, uşaq bağçası, tibbi müəssisələr, mağazalar, xidmət sahələri və s. olan qəsəbəsi yerləşdirilıir. Belə qəsəbələrdə 10 mindən 50 minədək əhali məskunlaşır ki, onlardan yalnız bir hissəsi İES-də çalışır. Buna görə də belə yaşayış məskənlərindəki işçilərin stansiyada işləyən ailə üzvlərinin iş problemi olmur.

İstilik Elektrik Stansiyasının işi enerjinin təbiətdə bir növdən başqa növə keçməsini praktiki olaraq nümayiş etdirir. Üzvi yanacağın tərkibində olan, günəş enerjisinin təsirindən formalaşan enerji qazanın odluq kamerasında qazların istilik və işıq enerjisinə çevrilir, sonra bu enerji buxarın istilik enerjisinə transformasiya olunur, daha sonra buxarın gücü turbini hərəkətə gətirir və mexaniki (fırlanma) enerjiyə çevrilir ki, nəhayət fırlanan generatorda elektrik enerjisinə çevrilir. İstehlakçıya çatdıqdan sonra elektrik enerjisi öz növbəsində işıq, istilik, mexaniki, kimyəvi və başqa növ enerjilərə çevrilir. Beləliklə, enerjinin praktikadakı təbii dövriyəsi zamanı enerjinin itməməsi və bir növdən başqa bir növə keçməsi qanununun, eləcə də termodinamika qanunlarının təzahürü bu şəkildə baş verir.

Enerjinin bir növdən başqa bir növə keçməsi prosesində enerji daşıyıcısına verilən enerjinin hamısı digər enerji növünə çevrilmir. Bu enerjinin bir hissəsi proses zamanı itir. Bu ilkin enerjinin müəyyən bir hissəsinin prosesin özünün həyata keçirilməsinə sərf edilməsi ilə izah edilir. İstilik ekvivalentinin ilkin enerjiyə və əldə edilən yeni növ enirjiyə olan nisbəti hər-hansı elektrik stansiyasının faydalı iş əmsalını (FİƏ) təşkil edir.

Müxtəlif növ elektrik stansiyalarında FİƏ 28-30%-dən 45-60%-ə kimi dəyişir. Kombinə olunmuş istilik elektrik stansiyalarında isə faydalı iş əmsalı 70-80% -ə kimi yüksələ bilir. İstilik Elektrik Stansiyasının FİƏ-sini aşağıdakı formul ilə hesablamaq olar:

$$\eta_{İES} = \frac{E_{bur} \cdot 860}{B \cdot Q} \cdot 100, \% \qquad (4.1)$$

Burada: $\eta_{İES}$ – İES-in FİƏ;
$E_{bur}$ – enerjinin buraxılması, kV·s;
$B$ – yandırılmış yanacağın miqdarı, kq;
$Q$ – yanacağın istiliktörətmə qabiliyyəti (kaloriliyi), kkal/kq;
860 – elektrik enerjisinin ekvivalenti, kkal/kBt·s.

Məsələn, İES-də $E_{ist}$ = 100 mln kVt·s miqdarında elektrik enerjisi istehsal olunmuşdur. Bu enerjinin istehsal olunmasına isə $Q$ = 4 560 kkal/kq kalorili $B$ = 54,3 min ton kömür sərf olunmuşdur və eyni zamanda bundan 8,4 mln kVt·s stansiyanın fərdi ehtiyacları üçün sərf edilmişdir İES – $E_{frd}$. Bu zaman netto FİƏ- $\eta_E^{nt}$ (3.2) formuluna əsasən müəyyənləşir:

$$\eta_E^{nt} = \frac{(E_{ist} - E_{feh}) \cdot 860}{B \cdot Q} \cdot 100 = \frac{91,6 \cdot 860 \cdot 10^6}{54,3 \cdot 4560 \cdot 10^6} \cdot 100 = 31,8\% \qquad (4.2)$$

Bununla yanaşı burada ($в_e$) yanacağın 1 kVt·s-a düşən xüsusi sərfiyyatı (4.3) formuluna əsasən müəyyənləşir:

$$в_e = \frac{54,3 \cdot 10^9 \cdot (4560/7000)}{(100 - 8,4) \cdot 10^6} = 386,2\ q/kVt \cdot s \qquad (4.3)$$

$в_e$ həcmini FİƏ vasitəsilə də müəyyənləşdirmək mümkündür (3.4):

$$в_e = \frac{в_n}{в_e^{nt}} = \frac{122,8}{0,318} = 386,2\,\frac{q}{kVt} \cdot s \qquad (4.4)$$

Burada: $в_n$ = 122,8 q/kVt, ideal dövrə (tsikl) üçün şərti yanacağın xüsusi sərfidir, yəni FİƏ 100 % olduqda bu göstəriciyə nail olmaq olar.

### 4.2.1. Buxar-turbinli İstilik Elektrik Stansiyaları

Buxar-turbin qurğuları müasir dövrdə dünya ölkələrinin çoxunda əsas elektrik stansiyası növünü təşkil etməkdədir. Elektrik enerjisinin sənaye istehsalının təqribən 40%-i bu stansiyaların payına düşür. Buxar-turbin qurğulu İES-lər aşağıdakı növlərə ayrılır:

- yanacaq növünə görə: kömür, qaz-kömür, qaz-mazut, qaz və s.
- texnoloji tsiklinə görə: kondensasiyalı, istiləşdirmə ayrımlı, istehsalat ayrımlı, əkstəzyiqli və xüsusi (alıcının sifarişinə görə):
- iti buxarın parametrlərinə görə: aşağı təzyiqli – 15 at-a kimi, orta təzyiqli – 35 at-a kimi, yüksək təzyiqli – 110 at-a kimi, çox yüksək təzyiqli – 140 at-a kimi, ifrat kritik təzyiqli – 240 at və daha artıq.

Buxar-turbinli İES-in geniş yayılmasını nəzərə alaraq, texnoloji sistemləri və bu tipli elektrik stansiyalardakı avadanlıq növlərini, eləcə də qazan aqreqatlarının işindəki müxtəlif texnoloji prosesləri daha yaxından nəzərdən keçirək.

İstilik Elektrik Stansiyasının prinsipial istilik sxemi elektrik stansiyasının əsas aqreqatları ilə köməkçi qurğuları arasındakı texnoloji əlaqələrin birxətli təsviridir. *Şəkil 4.4*-də turboaqreqatının istiləşdirmə ayrımı olan İEM-in prinsipial istilik sxemi göstərilmişdir.

İstiləşdirmə ayrımlı İEM-nin iş prinsipi istilik sxeminə görə belədir:baş buxar xətti (2) vasitəsilə qazan qurğusundan (1)

gələn iti buxar buxar turbininin yüksək təzyiqli silindirinin (3) işçi pərlərinə daxil olur. Genişləndikdən sonra buxarın kinetik enerjisi elektrik generatoru (5) ilə eyni valda (4) yerləşən turbin rotorunun fırlanma mexaniki enerjisinə çevrilir. Buxarın genişlənmə prosesində orta təzyiqli silindirdən buxarun bir




*Şək. 4.4. İstiləşdirmə ayrımlı İEM-nin prinsipial sxemi*

hissəsi götürülərək şəbəkə suyunun (7) qızdırıcısına (6) yönəldilir. İşlənmiş buxar turbinin axırıncı pilləsindən kondensatora ötürülür və sonra istilik mübadiləsi nəticəsində kondensatlaşaraq boru kəməri (8) vasitəsi ilə nasosdan (9) istifadə edilməklə yenidən qazan qurğusuna göndərilir. Alınan enerjinin çox hissəsi elektrik generatorunda (9) elektrik cərəyanı yaratmaq üçün istifadə olunur.

İstilik Elektrik Mərkəzi (İEM) adlandırılan belə elektrik stansiyaları məlum olduğu kimi elektrik və istilik enerjisinin kombinə edilmiş istehsalı üçün istifadə edilir ki, bu da nəhəng şəhərlərin sənaye və kommunal-məişət ehtiyacının ödənilməsi üçün nəzərdə tutulmuşdur.

Çoxlu sayda mürəkkəb qarşılıqlı əlaqəli sistemdən ibarət istilik sxeminə malik olan İES-dən fərqli olaraq, sırf kondensasiyalı elektrik stansiyaları (KES) daha sadə sxemə və bir qayda olaraq blok quruluşuna malik olur. Yəni, hər bir turboaqreqat özünün buxar qazanı ilə birbaşa, baş buxar kəməri ilə əlaqələnir. Bu halda istilik sxemi əhəmiyyətli dərəcədə sadələşir və kapital xərcləri azalır. Digər tərəfdən eninə əlaqə sxemin olmaması və qonşu qazan qurğularından buxar təminatının mümkünsüzlüyü qazanlardan birinin zədələnməsi halında enerji blokunun bütünlüklə dayanmasına gətirib çıxarır. Qazan qurğularının etibarlığının turbinlərə nisbətən aşağı olmasını, enerji blokunun isə hər dəfə işə salınma və dayandırılması enerji istehsalında fasilələr yaratması ilə yanaşı daha çox buxar və su itkisinə yol açdığını nəzərə alaraq, böyük güclü enerji blokları paralel işləyən iki buxar generatoru ilə təmin olunur. Bir buxar generatoru ilə təchiz edilən monobloklardan fərqli olaraq belə enerji qurğuları dubl-blok adlandırılır.

### 4.2.2. Qaz və buxar-qaz turbinli İES

20 ci əsrin 70-ci illərindən başlayaraq (yəni üzvi yanacağın bahalaşması və “parnik effekti”nə qarşı mübarizə ilə başlayan dünya energetik böhranın yaranması ilə) qaz turbin qurğularına olan tələbat daha da artdı. Qaz turbin qurğularının vahid gücü 150 və hətta 200 MVt-dək, iş prosesinin temperaturu isə 1300 $^0$C və daha çox artırıldı.

Müasir *qaz turbin qurğularının* FİƏ 33-39% təşkil edir. Qaz turbin qurğularının (QTQ) səmərəliliyi ümumiyyətlə qaz

pistonlu güc qurğularından daha aşağıdır. Qaz turbinlərinin tam istilik potensialını reallaşdırarkən yüksək FİƏ-yə nail oluna bilər. Gücü çox olan qaz turbin qurğularında işlənmiş qazların yüksək temperaturu nəzərə alınmaqla, qaz və buxar turbinlərinin birlikdə istifadəsi mümkündür. Belə halda yanacaq enerjisindən istifad səmərəliliyi əhəmiyyətli dərəcədə 60%-ə qədər artıra bilər. Belə yanaşma qurğunun səmərəliyini artırmaqla yanaşı, layihənin qiymətinin və mürəkkəbliyinin artmasına səbəb olur.

Qaz turbin qurğularında istehsal olunan elektrik enerjisinin istilik enerjisinə nisbəti ~ 1:2 nisbətindədir.

Ehtiyaclardan asılı olaraq qaz turbinli qurğular əlavə olaraq buxar və ya isti su qazanları ilə təchiz olunmuşdur ki, bu da istehsal ehtiyacları üçün müxtəlif təzyiqli buxar və ya standart temperaturlu isti su əldə etməyə imkan verir. İki növ enerjinin birlikdə istifadəsi ilə QTİES-ın yanacağın enerjisindən istifadə əmsalı (FİƏ) 90% -ə qədər artır.

İstilik enerjisini istifadə edərək elektrik enerjisi istehsal olunan elektrik stansiyasının işləmə rejimi öz texniki termininə malikdir - *kogenerasiya*.

Qaz turbin qurğularından, əlavə xərc sərf etmədən çox miqdarda istilik enerjisinin alınması imkanı kapital qoyuluşu sərmayəsinin daha sürətli qayıdılmasını nəzərdə tutur.

Qaz turbin qurğularının güclü istilik elektrik stansiyaları və mini istilik elektrik stansiyaları üçün güc avadanlığı kimi istifadəsi iqtisadi cəhətdən əsaslandırılmışdır, çünki bu gün qazla işləyən elektrik stansiyaları tikinti üçün ən cəlbedici xususi xərclərə və sonrakı istismar üçün aşağı qiymətə malikdir.

İlin istənilən vaxtında izafi istilik enerjisi istifadə edilərək, dilerlər vasitəsilə, elektrik enerjisi sərf etmədən, istənilən məqsəd üçün binaları tam sərinləşdirmək imkanı olur. Soyudulmuş soyuq su isə sənaye məqsədləri üçün, müxtəlif istehsal dövrlərində istifadə edilə bilər. Bu texnologiya,yəni elektriklə istilik enerjisinin və soyuqluğun birgə istehsalı-*trigenerasiya* adlandırılır.

Qaz turbinli qurğuların istifadəsinin səmərəliliyi ən az 1-3% -dən maksimum 110-115% -ə qədər olan müxtəlif elektrik yüklərində təmin edilir.

Qaz turbinli qurğuların - insanların birbaşa yaşadığı yerlərdə qaz turbinlərinin istifadəsində müsbət amili zərərli tullantıların aşağı (9-25 ppm) səviyyəsindədir. Bu cür mükəmməl ekoloji göstəricilər qaz turbin qurğularını insanların məskunlaşdıqları yaxın ərazilərdə ekoloji problem yaratmadan yerləşdirməyə imkan verir.

Qaz turbinli qurğular üçün bu meyar – dizel elektrik stansiyalarından daha yaxşıdır.

Qaz turbin qurğularından istifadə edərkən, istehsalçı katalizatorlar və nəhəng tüstü borularından istifadə edilmədiyinə görə tikinti və istismar mərhələlərində əlavə gəlirlər əldə edir.

Qaz turbinli elektrik stansiyasının avtomatlaşdırılmış idarəetmə sistemləri istismar heyətinin azaldılmasına və stansiyanın məsafədən idarə olunmasına imkan verir. Fövqəladə hallarda, kompleks avtomatik mühafizə və yanğınsöndürmə sistemləri təmin olunur.

*Şəkil 4.5*-də Siemens şirkəti istehsalı olan V94.3 tipli QTQ göstərilib [40]. Atmosfer havası mürəkkəb bir hava təmizləyici qurğudan şaxtaya (4) , oradan da hava kompressorunun axın hissəsinə (16) daxil olur. Kompressorda hava sıxılır. Tipik kompressorlardakı sıxılma nisbəti 13-17 atm təşkil etdiyinə görə, qaz turbin traktındakı təzyiq 1,3-1,7 MPa (13-17 atm) -dən çox deyil. Bu, qaz turbininin və buxar turbininin arasındakı digər ciddi fərqdir, buxar təzyiqinin qaz turbinindəki qaz təzyiqindən 10-15 qat daha çox olmasıdır. İş mühitinin aşağı təzyiqi, korpusun divarlarının kiçik qalınlığını və onların qızmasının asanlığını müəyyənləşdirir. QTQ-nin manevr etmı imkaları bununla təyin edilir, yəni tez işəburaxma və dayanmağa qadirdir. Buxar turbininin işə salınması 1 saatdan bir neçə saata qədər davam edirsə, ilkin temperatur

vəziyyətindən asılı olaraq 10-15 dəqiqə ərzində qaz turbinini işə salmaq olar.

Yanma kamerasından isti qazlar qaz turbininin axın hissəsinə daxil olur. Axın hissəsində qazlar demək olar ki, atmosfer təzyiqinə qədər genişlənir, çünki qaz turbininin arxasındakı sahə ya tüstü borusu ilə, ya da hidravlik müqaviməti az olan bir istilik dəyişdiricisi ilə əlaqəlidir.




*Şəkil 4.5. V94.3 qaz turbin qurğusu [40].*

Qaz turbinindəki qazların genişlənməsi ilə onun valında güc yaranır. Bu güc qismən hava kompressorunun intiqalında, artıqlığı isə generatorun rotorunda sərf olunur. Qaz turbinlərinin xarakterik xüsusiyyətlərindən biri kompressorun qaz turbininin yardığı gücün təxminən yarısını tələb etməsidir. Məsələn, 180 MVt gücündə qaz turbinində, kompressorun gücü 196 MVt təşkil edir. Bu, qaz turbininin və buxar - qaz turbininin

arasındakı əsas fərqlərdən biridir: ikincisi, bəsləyici suyu hətta 23.5 MPa (240 at) təzyiqə qədər sıxmağa sərf olunan güc buxar turbininin yalnız bir neçə faizini təşkil edir. Bu, suyun əlçatmaz bir maye olması və havanın sıxışdırılması üçün çox enerji tələb etməsi ilə bağlıdır.

Beləliklə, qaz turbininin çıxışında qazların temperaturu olduqca yüksəkdir və yanacaq yandırmaqla əldə edilən xeyli istilik sanki tüstü borusuna ötrülür. Buna görə qaz turbininin avtonom iş şəraitində onun səmərəliliyi aşağıdır: tipik qaz turbinləri üçün bu 35-36% -dir.Bu da uyğun avadanlıqların səmərəliliyindən xeyli azdır. Bununla yanaşı, aşağıda müzakirə ediləcək qaz turbininin "sonluğuna" istilik dəyişdiricisi quraşdırıldıqda məsələ kəskin şəkildə dəyişir.

Buxar-qaz istilik-elektrik stansiyaları XX əsrin əvvəllərində yaranaraq istilik energetikasında qlobal dəyişiklik yaratdı. Qaz sənayesinin sürətlə inkişaf etməsi elektroenergetikada ağır yanacaq növlərindən (kömür, torf, mazut və s.) istifadəni yarıya qədər azaltmağa imkan verdi.

*Həmdövrəli buxar-qaz qurğuları* (BQQ) iki ayrı qurğudan ibarətdir: buxarla və qazla işləyən turbin. Qaz turbin qurğusunda təbii qaz, yanacaq və digər yanacaqların yanma məhsulları turbini fırladır. Turbinlə eyni valda olan rotorun fırlanması səbəbindən 1-ci generatorda elektrik cərəyanı istehsal edilir. Yanma məhsulları qaz turbinindən keçərək enerjisinin bir hissəsini verir və çıxışda tüstü qazları təxminən 500 ° C temperaturda olur. Qaz turbininin çıxışından sonra tüstü qazları suyun və yaranan buxarın qızdırıldığı utilizasiya qazanına göndərilir. Nəticədə 100 atm təzyiqində çox təzyiqdə qızdırılmış buxar, 2-ci elektrik generatorunu idarə edən buxar turbinində istifadə olunur. Nəticədə 2-ci generatorda da elektrik cərəyanı istehsal edilir Buxar və qaz turbinlərinin eyni valda yerləşdiyi BQQ-lər də mövcuddur və bu halda bir elektrik generatorundan istifadə olunur.

Həmdövrəli BQQ-lər 58 - 64% hədlərində elektrik səmərəliliyi əldə etməyə imkan verir. Buxarla işləyən qurğuların FİƏ 33-45%, qaz turbinli qurğular üçün isə 28-42% təşkil edir, eyni zamanda sonuncunun istismar xərcləri daha azdır və tikinti-quraşdırma işlərinin 9-12 ay ərzində yekunlaşdırılması mümkündür.

Həmdövrəli BQQ-lər nisbətən yeni bir texnologiya hesab olunur.

Həmdövrəli buxar-qaz tsiklinin nümunəsində gələcəkdə kiçik bir buxar turbininin istismarı üçün avtomobilin işlənmiş qazlarından istifadə edilməsi perespektivlərinin BMW mütəxəssisləri tərəfindən qəbul edilməsi maraq doğurur.

Növbəti sxemdə həmdövrəli BQQ-nin prinsipial sxemi təqdim olunur (*şək. 4.6*).

Təqdim olunan həmdövrəli BQQ aşağıdakı kimi fəaliyyət göstərir. Qurğunun işə salınması iki üsulla ola bilər - qazan-utilizatordan (7) buxar turbininə və ya xarici buxar mənbəyindən işəburaxma turbininə buxar verməklə.

Qaz-turbin qurğusunun, temperaturu 500-600 $^0$C-yə çatan işlənmiş qazları, buxar turbinini hərəkətə gətirən, müvafiq parametrlərə malik olan iti buxarın istehsal olunduğu utilizator qazanının yanma kamerasına verilir. Qaz-turbin qurğusunun buxar turbininin valı ilə qurğunun fərdi generatorları hərəkətə gətirilir. Zərurət olduğu halda, buxar istehsalının artırılması və ya parametrlərinin artırılması məqsədi ilə utilizator qazanının funksiyası dəyişdirilərək yanma qurğusuna çevrilə bilər.

Bu halda yanacağı sonadək yandıran buxar-qaz qurğusu əldə olunur.

Yuxarıda qeyd olunan sxemdə gücü 150 MVt olan bir qaz-turbin qurğusu və gücü 200 MVt olan ikinci bir kondensasiyalı buxar turbini nəzərdə tutulmuşdur. Yanacaq (qaz, dizel yanacağı) kompressordan təzyiq altında (13-15 ata) çıxan hava ilə birlikdə qaz-turbin qurğusunun yanma kamerasına verilir. Yanacağın yüksək hava artıqlığı şəraitində yanmasından sonra

($_{ged}$ = 2,0-3,0) temperaturu 1000–1300$^0$C olan yanma kamerasından şıxan qazlar qaz turbinin axın hissəsinə verilir. Qaz turbininin pillələrində öz potensialının böyük hissəsini sərf etdikdən sonra o hələ də kifayət qədər yüksək temperatur ilə (500-600 $^0$C) utilizator qazanının kamerasına verilir. Bununla da




*Şək. 4.6. Həmdövrəli BQQ-nin prinsipial sxemi:*

*1 – QTQ-nin hava kompressoru; 2 – yanma kamerası; 3 yanacaq; 4 – qaz turbini; 5 - elektrik generatoru; 6 – buxar turbini;7 – qazan-utilizator; 8 – BT-nin kondensatoru; 9 – kondensat nasosu; 10 - regenerasiya sistemi; 11 – qazan-utilizatorun başləyici nasosu; 12 - tüstü borusu.*

qaz-turbin qurğusunun tsikli (dövrəsi) başa çatır. Bu tsiklin ilkin prosesidir: yanacağın verilməsi – yanma – qaz turbininin

generator ilə fırlanması – qazların buraxılması əlbəttə ki, fasiləsiz olaraq həyata keçirilir.

Daha sonra tsiklin ikinci (buxar-turbin) prosesesi işə başlayır: işlənmiş qazların qaz-turbin qurğusunun utilizator qazanına verilməsi – qızışmış buxar istehsalı – buxar turbinin generatorla birlikdə fırladılması – işlənmiş buxarın kondensatora verilməsi – buxarın kondensatlaşdırılması – onun yenidən qızıdırılması və qazana ötürülməsi.

Qaz-turbin qurğusu bəzən ikinci prosesdən istifadə olunmadan da istismar olunur. Bu halda qurğu istiliyi utilizasiya etmədən, yəni yüksək (450-550 $^{0}$C) temperaturda olan işlənmiş qazları tüstü borusuna buraxaraq tam elektrik rejimində işləyə bilər. Belə rejimdə adətən, ümumi istifadədə olan vahid elektrik şəbəkəsinin sutkada 3-4 saat səhər və axşam maksimum ehtiyacının qarşılanmasında iştirak edən pik QTQ-ləri işləyir. Lakin bu qurğuları istifadədə olan İES-ın və istiləşdirmə buxar turbinləri vasitəsilə isitmə üçün istifadə olunacaq işlənmiş qazları utilizator qazanlarında utilizasiya edən qazanxanaların əlavəsi olaraq quraşdırılması daha məqsədəuyğundur.

### 4.2.3. Dizel ektrik stansiyaları

İstilik Elektrik Stansiyaların bu kateqoriyasında daxili yanma mühərriklərindən (DYM) istifadə olunur. Dizel elektrik stansiyaları bu tip elektrik stansiyaların ən geniş yayılmış növlərindən biridir. Bu stansiyalardan səhra və dağlıq zonalarda, eləcə də meşə təsərrüfatı və faydalı qazıntıların işlənməsi rayonlarında (şaxta və digər mədənlərdə), kənd təsərrüfatında və s. istifadə olunur.

Dizel Elektrik Stansiyaları elektrik şəbəkəsində elektrik enerjisi kəsintiləri olan və elektrik enerjisinin fasiləsiz verilməsi üçün xüsusi təminat tələb olunan istehlakçılarda quraşdırılır. Bu stansiyalar çay və dəniz gəmiçiliyində, hərbi-səhra bazalarında, fövqəladə vəziyyət şəraitində əvəzsiz rola malikdir.

Dizel Elektrik Stansiyaları, əsasən ümumi elektrik şəbəkəsi inkişaf etdirilməyən ərazilərdə daha çox yayılmışdır. Bu stansiyaların əsasında müxtəlif gücə malik olan dizel maşınları dayanır. Şəraitdən, yanacaq təminatından və digər faktorlardan asılı olaraq DES-lər həm stasionar (buxar-turbin və qaz-turbinli İstilik Elektrik Stansiyaları tərzində), həm də avtoqoşquların, dəmiryol vaqonlarının, çay və dəniz barjalarının üzərinə quraşdırılmaqla daşınan olur. Dizel aqreqatları maye yanacaqla yanaşı qazla da işləyə bilir. Son illər alternativ yanacaq növlərindən də istifadə olunur: qamış spirtindən, palma yağından və digər sintetik yanan maddələrdən. Daşınan DES-lər 10 MVt gücə malik ola bilər.

DES-in istilik balansı aşağıdakı tənliklə təyin edilir (4.5):

$$Q_n^r = Q_e + Q_{soy} + Q_{işl} + Q_{k.n.} + Q_{dig} \qquad (4.5)$$

Burada, $Q_n^r$ - yanacağın yanma istiliyi;

$Q_e$ – (0,3-0,4) $Q_n^r$ bərabər olan işə çevrilmiş istilik;

$Q_{soy}$ – (0,2-0,3) $Q_n^r$ bərabər olan və soyuducu su vasitəsilə aparılan istilik;

$Q_{işl}$ – (0,2-0,3) $Q_n^r$ bərabər olan və işlənmiş qazlarla aparılan istilik;

$Q_{x.n.}$ –( 0-0,1) $Q_n^r$ bərabər olan kimyəvi natamam yanma ilə itən istilik;

$Q_{dig}$ – (0,05-0,15) $Q_n^r$ təşkil edən digər itkilər.

Dizel Elektrik Stansiyalarının texniki-iqtisadi göstəricilərinin qiymətləndirilməsində aşağıdakı anlayışlardan istifadə olunur:

1. Effektiv FİƏ ,$\eta_e$ – bu indikator FİƏ, $\eta_i$ və mexaniki FİƏ, $\eta_m$ nəzərə alınmaqla mühərriyin faydalı iş əmsalıdır (4.6):

$$\eta_e = \eta_i \cdot \eta_m . \qquad (4.6)$$

2. İndikator FİƏ, $\eta_i$ – indikator işinə çevrilmiş istiliyin $Q_i$ sərf edilmiş bütün istiliyə $Q_{ist}$ olan nisbətidir, yəni:

$$\eta_i = \frac{Q_i}{Q_{ist}} = \frac{Q_i}{B \cdot Q}, \qquad (4.7)$$

burada, $B$ – yanacağın bir saniyəlik sərfiyyatı, kq/san;
$Q$ – yanacağın kalorilıy(İstiliktörətmə qabiliyyəti), kkal/kq və ya kC/kq.

Bu göstərici həqiqi tsikldə istilik itkisinin və silindrdəki sürtünmə ilə yaranan mexaniki itkinin nəzərə alınması ilə istiliyin istifadə olunmasını qiymətləndirir.

3. Mexaniki FİƏ ,$\eta_m$ mühərriyin yastıqlarının və detal birləşmələrindəki sürtünməyə sərf olunan gücdən ibarətdir.

Bu tip elektrik stansiyaları digər elektrik stansiyaları ilə müqayisədə aşağıdakı üstünlüklərə malikdir:

1. Tez bir zamanda quraşdırılması, belə ki, bu cür stansiyanın quraşdırılması üçün xüsusi tikililərə ehtiyac olmur. Avadanlığın kompakt halda olması onun istənilən binada və ya çardax altında quraşdırılmasını mümkün edir.

2. Bu stansiyalardan həm stasionar, həm də daşınan variantda istifadə oluna bilər.

3. Yüksək səviyyəli etibarlılıq və digər stansiyalarla müqayisədə sadə şəkildə idarə olunması.

4. Stansiya avadanlığının avtomobil, traktor və hətta qoşqulu (dəvə, öküz, at, it qoşqusu) nəqliyyatın keçə biləcəyi istənilən yerə çatdırılması imkanı. Bu stansiyalardan istifadə oluna biləcək insan yaşayışı və fəaliyyəti məntəqələrinə geoloji ekspedisiyalar, faydalı qazıntı mənbələrinin (neft, qaz, kömür, qızıl, almaz və s.) kəşfiyyatı, meşə, balıqçılıq və ovçuluq təsərrüfatları, otlaq sahələri və s. daxildir.

Beləliklə, dizel qurğuları təsərrüfatın istənilən sahəsində istifadə oluna biləcək daha universal elektrik stansiyaları hesab

edilə bilər. Məhz buna görə də bu stansiyalar istehsal olunan digər enerji mənbələri ilə müqayisədə daha çox yayılmışdır.

### 4.2.4. Qaz-porşen elektrik stansiyaları

Qaz – porşen qurğuları (QPQ), yüksək qənaətli, orta surətli, iki/dördtaktlı məcburi alışmalı daxili yanma aqreqatıdır. Qaz – porşen aqreqatları həm elektrik, həm də istilik enerjinin istehsalına imkan verir. Bu qurğular 50 – 100% güc, uzunmüddətli istismar rejimində isə nominal gücün 70%-ni keçməməlidir.

*Cədvəl 4.1*

*Daxili Yanma Mühərriyinin texniki xarakteristikaları*

| Mühərriyin növü | Sıxılma dərəcəsi, ζ | Mexaniki FİƏ, ηm | İndikator FİƏ, $\eta_i$ | Effektiv FİƏ, $\eta_e$ | Yanacağın xüsusi sərfiyyatı q/kVt·s |
|---|---|---|---|---|---|
| Dördtaktlı mühərriklər | *13,0-16,0* | *0,78-0,85* | *0,42-0,48* | *0,32-0,39* | *315-380* |
| İkitaktlı mühərriklər | *13,0-16,0* | *0,72-0,80* | *0,42-0,46* | *0,31-0,35* | *350-390* |
| Karbyuratorlu mühərriklər | *4,5-7,0* | *0,80-0,90* | *0,22-0,28* | *0,18-0,24* | *510-680* |
| Qaz mühərrikləri | *6,0-9,0* | *0,78-0,82* | *0,25-0,32* | *0,20-0,27* | *450-615* |

*Cədvəl 4.1*-də müxtəlif daxili yanma mühərriklərinin texniki-iqtisadi göstəriciləri verilmişdir. Verilən məlumatlardan belə bir nəticəyə gəlmək olar ki, daxili yanma mühərrikli elektrik stansiyaları iqtisadi cəhətdən digər İES ilə tam olaraq rəqabət apara bilər. Eyni zamanda, qeyd etmək lazımdır ki, istilik maşınlarından çıxan tüstü qazlarının istiliyi utilizasiya edilərək yanacağın, eləcə də sənaye və yaşayış binalarının qızıdırılmasında istifadə oluna bilər. Belə olan halda QPQ istilik

– elektrik mərkəzi rejimində işləyə və 80-90% FİƏ-yə malik ola bilər.

Turbokompressor, çıxan qazların enerjisindən istifadə edir və mühhərrikin işi üçün lazımi hava- qaz qarışığı ilə təmin edir. Turbokompressorun köməkliyi ilə hava-qaz qarışığının təzyiq altında daxili-yanma mühərriyinin (DYM) yanma kamerasına verilməsi sayəsində daha yüksək güc əldə edilməklə yanaşı atmosferə atılan zərərli maddələrin azalmasına da nail olunur (*şəkil 4.7*).

Turbokompressor iki turbomaşın, bir valda yerləşən bir radial turbindən və bir mərkəzdənqaçma kompressorundan ibarətdir. Turbinin çarxları kompressor rotorunu hərəkətə gətirmək üçün işlənmiş qaz enerjisindən istifadə edir. Mühərriyin işi üçün lazım olan qaz-hava qarışığı kompressorun rotoruna sorucu borudan daxil olur. Kompressorun rotorunun köməkliyi ilə qaz – hava qarışığı əvvəlcədən sıxılmış halda diffuzor və basqı borusundan keçərək kompressorun karterindən qrışdırıcı boru xəttinə vurulur [41].

Qeyd edək ki, əvvvəlki paraqrafda qeyd olunan dizel elektrik stansiyalarının malik olduğu üstünklükləri, həmçinin QPQ-yə də şamil olunur. Yəni, QPQ-lər təsərrüfatın istənilən sahəsində istifadə oluna bilən daha universal elektrik stansiyaları hesab olunur. Bu baxımdan belə stansiyalar istehsal olunan digər enerji mənbələri ilə müqayisədə daha geniş tətbiq olunmuşdur.

Qaz-Porşen Elektrik Stansiyaları (QPES) kiçik və orta energetika kateqoriyasına aiddir. Aqreqatlarının gücü 0,1-dən 10-MVt-dək olan çoxlu miqdarda stasionar və mobil elektrik stansiyaları mövcuddur. Belə qurğular ümumi gücü 300 MVt olan İstilik Elektrik Stansiyaları formalaşdırmağa qadirdir. Bu gücdə stansiya Azərbaycan enerjisisteminin tərkibində fəaliyyət göstərir (dünyada qoyuluş gücünə görə ən böyük QPES hesab olunur).

QPES-in iş prinsipi daxili yanma mühərriyinin təbiqinə əsaslanmışdır – yanacaq qismində təbii qaz, bioqaz və ya digər




*Şək. 4.7. Qaz-trubin üfürmə konturunun sxemi:1 - məcburi vurulan hava; 2 - hava filtri; 3 – təmizlənmiş hava; 4 - qaz-hava qarışdırıcı; 5 - qaz; 6 - kompressora qarışıq;7- kompressorun çarxı; 8 - kompressordan qarışıq soyuducuya qədər; 9 - qarışıq soyuducu; 10 - soyudulmuş qarışıq; 11 - giriş qapağı; 12 - çıxış klapan; 13 – işlənmiş çıxan qaz turbininə; 14 - turbin çarxları; 15 – səsboğucu*

istənilən yanar qaz ola bilər. Yanacağın kamerada yanması nəticəsində ayrılan istilik enerjisi qaz-porşen mühərriyinə daxil olur. Sonra bu enerji elektrik enerjisi hasil edən geenratora daxil olur.

Beləliklə, iş prosesində qaz – porşen qurğusu iki növ enerji – istilik və elektrik istehsal edir. Bu prinsip kogenerasiya adlanır. Sxematik olaraq *şəkil 4.8.* verilmişdir.




*Şək. 4.8. Kogenerasiyanın ənənəvi enerji istehsalşıları ilə müqayisəsi.*

Eyni zamanda, qeyd etmək lazımdır ki, istilik enerjisinə olan tələbat bir qayda olaraq mövsümü xarakter daşıdığına görə, bütün fəsillərdə QPQ-nın faydalı iş əmsalının 85 – 90% səfiyyəsində istismarına nail olunması məqsədilə, müasir dövrdə elektrik, istilik enerjisinə əlavə olaraq "soyuq" enerji istehsalı dövrəsi əlavə edilən qurğular geniş tətbiq olunmağa başlamışdır. Belə stansiyalar – *trigenerasiya adlandırılır.*

Hal-hazırda bu tip enerji qurğuları kiçik şəhərlərdə, rayon mərkəzlərində və sənaye müəssisələrində kiçik İES-ın yaradılmasında geniş tətbiq olunur. Bu qurğuların kompakt

olmasını, texnologiyasının kifayət qədər sadə olmasını, personal və ətraf mühit üçün təhlükəsiz olmasını nəzərə alaraq, qaz-porşen və qaz-turbin aqreqatlı istilik elektrik stansiyaları həm böyük, həm də kiçik şəhərlər üçün əsas enerji mənbəyi rolunu oynaya bilər. Zavod istehsalının komplektləşməyə yaxın olması hesabına bu qurğular qısa zamanda (3-5 ay ərzində) quraşdırma və işə salınma imkanına malikdir. Belə ki, bunun üçün nə dəmir yoluna, nə yüksək tüstü borularına, nə mürəkkəb kimyəvi su təmizləyicilərinə, nə soyuduculara, nə su hövzələrinə, nə də ki, buxar-turbinli İES-ın fəaliyyəti üçün zəruri olan digər bahalı qurğulara ehtiyac olmur. Belə stansiyaların tam avtomatlaşdırılması və onların az miqdarda şəxsi heyətlə idarə olunması mümkündür.

Belə istilik elektrik stansiyalarında daha bir vacib müsbət cəhət ondan ibarətdir ki, bu tip stansiyanın güc aqreqatları istənilən maye və ya qaz yanacağında işləməyə qadirdir. Bu xüsusiyyət təbii qazın olmadığı, eləcə də neft yanacaqların çatdırılmasının çətin olduğu lakin digər enerji daşıyıcıların – bioloji resursların (heyvandarlıq və quşçuluq tullantıları), meşə təsərrüfatı və ağac emalı tullantıları, odun, kol, qamış və s. bol olduğu bölgələr üçün əvəzolunmazdır. Belə olan hallarda stansiyanın əsas avadanlığına əlavə olaraq süni yanacağın alınması üçün texnoloji prosesin yaradılması zərurəti meydana gəlir. Bunlara aşağıdakılar daxildir: bitki yağları (günəbaxan, raps, gənəgərçək, kətan və s.), texniki spirtlər (metil və etil), metan, karbon turşusu, hidrogen və s. Texnologiyanın tərkibinə aşağıdakı aqreqatlar daxil ola bilər:

- Bioreaktorlar- bu aqreqatlarda parçalanmış biokütlədən qıcqırdılma yolu ilə sutka ərzində kaloriliyi (istilik törətmə qabiliyyəti) 4-4,5 min kkal/$m^3$ olan metan qazı əldə olunur;
- Quru odun emalı üçün qaz generatoru - burada odunun havasız şəraitdə 450 $^0$C-dək qızdırılaraq parçalanmasına nail olunur;

- Biokütlə və odun emalı yolu ilə yandırılmaq üçün yararlı olan texniki spirtlərin alınması üzrə hidroliz qurğuları.

Növbəti onilliklərdə energetikada istiafdə olunan təbii qaz və neft məhsullarının həcmi kəskin şəkildə azalma şəraitində bioreaktorlar, hidroliz qurğuları və qaz generatorları energetik və məişət yanacağının alınması üçün əsas mənbə rolunun oynaması proqnozlaşdırılır.

*Şək. 4.9*-də fərdi yanacaq bazası olan mikroturbin qurğusunun prinsipial sxemi verilmişdir. Mikroturbinli kogenerasiya qurğusunun TA-100 RCHP numunəsində iş prinsipini nəzərdən keşirək.

Təmizlənmiş atmosfer havası kompressor girişinə (3) hava qəbuledici (4) vasitəsilə daxil olur. Kompressorda hava sıxılma nəticəsində qızdırılır, sonradan hava əlavə olaraq xüsusi bir qaz-hava istilik çevricisində (10) – rekuperatorda da qızdırılır. Belə yanaşma qurğunun elektrik səmərəliliyini təqribən iki dəfə artırmağa imkan verir. Sonra, yanma kamerasına (6) daxil olmadan əvvəl qızdırılmış və sıxılmış hava, təbi qaz yanacağı (9) ilə qarışdırılır, buradan homogen qaz-hava qarışığı yanma kamerasına daxil olur. Əvvəlcədən hava-qaz qarışığının hazırlanmasını, tullantı qazların emissiyasının səviyyəsini 100% elektrik yükündə, 15 % $O_2$ səviyyəsində 9 ppm, 50 % -dən aşağı yüklərdə isə demək olar ki, sıfıra endirmək mümkündür. Yanma kamerasını tərk edərək, çıxış qazları turbinin pərlərinə (7) daxil olur, burada genişlənir iş görörək turbini hərəkətə gətirir, eyni valda olan kompressor çarxını (3) və yüksək sürətli generatoru (2) da hərəkətə gətirir. Turbini (7) qaz borusu (8) vasitəsilə tərk edərək, işlənmiş qazlar rekuperatora (10) daxil olur, burada istiliyini kompressordan sonrakı havaya verir. Rekuperatorun çıxışında (10), işlənmiş qazlar keçid borusunu yönəldən bir baypas qaz çıxış xəttinə (14) və ya birbaşa utlizasiya qazanına (12) verilir. Utilizasiya qazanında, işlənmiş qazlar istiliyini bəsləyici suya verir, orada tələb olunan istiliyə qədər qızdırılır.

Turbinin konstruksiyasında sürət qutusu (reduktor) yoxdur. Rotorun sürəti praktik olaraq yükdən asılıdır və təxminən 69.000 ilə 96.000 dovr/dəq arasında dəyişir. İstehsal olunan yüksək tezlikli gərginlik ikiqat çevrilməyə məruz qalır: yüksək tezlikli dəyişən cərəyandan sabitə, sonra isə 50 və ya 60 Hz tezliyi olan 380, 400 və ya 480 V gərginlikli dəyişən cərəyana çevrilir. Çevirmənin prinsipal sxemi, kəsilməz enerji təchizatında (UPS) istifadə edilən sxemlərə anolojidir. Bu, çıxış üçfazlı gərginliyin düzgün sinusiodal formasında olmasını təmin edir.




*Şək.4.9. Mikroturbin qurğusunun funksional sxemi (mənbə: TA-100RCHP -Calnetix Power Solutions şirkəti)*

Fərdi yanacaq bazası olan stansıyalarda (yəni təbii qaz və neft məhsullarından istifadə olunmadan) enerji qurğusunun qiyməti ənənəvi stansiyalarla rəqabət apara biləcək səviyyədədir. Bundan əlavə tullantılardan alınan məhsulların (odun külü, biokübrə, odun kömürü, məişət qazı və s.) realizə edilməsi də enerji istehsalının maya dəyərini azaldır.

# FƏSİL V

## QEYRİ - ƏNƏNƏVİ (BƏRPAOLUNAN) ENERJİ MƏNBƏLƏRİ

## GİRİŞ

Üzvi yanacaq eytiyatlatlarının getdikcə tükənməsi və dünyada ekoloji vəziyyətin pisləşməsi ilə qeyri-ənənəvi energetika sahəsinin əhəmiyyəti daha da artırmışdır. Aparıcı ekspertlərin qiymətlənləndirilmələrinə görə ənənəvi enerji mənbələrinin yaratdığı ekoloji fəlakətlər, əvvəllər qeyd olunduğu kimi bu 100 illər sonra deyil, artıq 40-50 ildən sonra özünü ciddi şəkildə biruzə verəcəkdir. Hətta demək olar ki, bu, praktiki olaraq dünyanın bir çox yerlərində artıq bu gün də baş verir. Lakin, bu proses özünü fluktasiya və qeyri-müntəzəm şəkildə göstərir. Təəssüf ki, dünya əhalisinin çox hissəsini yaxınlaşmaqda olan energetik problemlər və bu problemlərdən irəli gələn ekoloji fəlakətlər düşündürmür. Doğrudur, son illər keçən XX əsrdə yerin altında yerləşən enerji resurslarının – kömürün, neftin, qazın yarısından çoxunun çıxardılaraq yandırılmasının nəticələri ilə bağlı insanlar arasında müəyyən həyəcan hiss olunur. Yaranmış vəziyyət energetikləri və siyasətçiləri ənənəvi enerjiyə alternativ energetikanın və enerji resurlarının qənaəti yollarının axtarışına vadar etmişdir. Bunun nəticəsidir ki, 2015-ci ildə ekoloji fəlakətin qarşının alınması məqsədilə Parisdə təşkil olunmuş konfransda qəbul olunmuş Saziş 197 ölkə tərəfindən imzalanmışdır. Bir sözlə, son yüz ildə bəşəriyyətin surətli inkişafına təkan verən, elektrik enerjisinin ənənəvi növlərinin inkişafı bərpaolunan enerji mənbələri əsaslı stansiyalara nisbətən geridə qalır.

## 5.1. HİDROELEKTRİK STANSİYALARI

### 5.1.1. Sudan istifadənin tarixi

Hər zaman su insanların həyatını və məhsuldar qüvvələrin inkişafını təyin edən ən vacib amil olmuşdur (*şəkil 5.1*).

Sudan istfadə ilə bağlı qədim və müasir insanlar qarşısında duran hədəfi müqayisə etsək, görərik ki, əsrlər keçsə də onlar dəyişməyib. Hədəfləri növbəti ümumi formada ifadə edə bilərik: su obyektlərinin mənimsənilməsi və tənzimlənməsi. Ancaq bu ümumi məqsəd çərçivəsində görülən vəzifələr çox genişlənmişdi. Minilliklər boyu əkinçilik üçün su ehtiyacları, yaşayış məntəqələrinin su təchizatı, daşqından qorunma və su obyektlərinin nəqliyyat məqsədləri üçün istifadəsi ilə yanaşı bir çox başqa vəzifələr ortaya çıxmışdır. Məsələn, sənaye su təchizatı, istilik enerjisi, istirahət, çirkab sularının təmizlənməsi, balıqçılıq, meyvəçilik, sualtı mədən və s.

Sivilizasiyanın inkişafı, yeni fəaliyyət sahələrinin yaranması ilə insanların getdikcə daha çox suya ehtiyacı olmuşdur. Sivilizasiyanın inkişafı adambaşına istehlak edilən suyun həcmi ilə ölçülə bilər. İndi dünyanın ən inkişaf etmiş ölkəsində - ABŞ-da adambaşına gündə təxminən 7000 litr su istehlak olunur, bəzi inkişaf etməkdə olan ölkələrdə isə bu göstərici 30 litrdən çox deyil, yəni 200 dəfə azdır. Daş dövrü adamı, yəqin ki, gündə 10 litrdən az su istehlak edirdi. Lakin, qədim Roma dövlətinin intibah dövründə bir adam gündə 700 litrə qədər su istehlak etmişdir, yəni bir sıra inkişaf etməkdə olan ölkələrin və Roma sakinlərinin Orta əsrlərdə istehlak etdiklərindən çox. İmperator Trayan hakimiyyəti dövründə (98-117 il), 1 milyon Roma əhalisinin hər sakini gündə 1000 litrə qədər su istifadə edirdi (1968-ci ildə cəmi 475 litr olmuşdu). Buna görə, suyun istehlak səviyyəsi ilə, sivilizasiyaların,

ölkələrin və şəhərlərin yüksəlişini və tənəzzülünü qiymətləndirmək olar.



*Şək. 5.1. Şəlalələr su enerjisinin gücünü təcəssüm etdirir.*

Arxeoloji tapıntılar və qədim yazı mənbələri antik dövrdə suvarma və hidravlik qurğuların geniş yayılması haqqında təsəvvür yaradır. Misirdə, Hidistanda, Mesopotamiyada 7-8 min il əvvəl daşqından yaşayış məntəqələrinin qorunması üçün bəndlər inşa olunmuşdur. Təqribən 6 min il əvvəl Çindəki Sarı çay vadisində süni suvarma sahələri ilə əhatə olunmuş ilk şəhərlər meydana çıxmışdı. 5-6 min il əvvəl Şumer və Akkad dövlətlərində Dəclə və Fərat çaylarının tənzimlənməsi işləri aparılmış, böyük kanallar inşa edilmiş, bunlar təkcə suvarma üçün deyil, həm də yaşayış məntəqələrini su təchizatı və nəqliyyat sistemləri üçün istifadə edilmişdir. Bu işlərə su istifadəsini tənzimləyən qanunların yaranmasını zəruri etmişdir.

dəyirmanları qurulmuşdur, onların sayı yalnız 1920-ci illərdə azalmağa başlamışdır.

### 5.3.2. İlk külək qurğuları

XX əsrin əvvəllərində, külək mühəndisliyinin inkişafı üçün elmi əsasları mövcud olan şəraitdə, dünyada külək fermalarının (stansiyalarının) inşaası baş vermişdi.

Külək fermaları, funksional bir-biri ilə əlaqəli və küləyin kinetik enerjisini elektrik enerjisinə çevirərək elektrik enerjisi istehsal edən vahid bir kompleks olmaqla bir və ya bir neçə külək turbinindən ibarət təşkil oluna bilər.

Külək stansiyaları, bir qayda olaraq, ümumi bir enerji sistemenində, eləcə də ayrı bir istehlakçını elektrik enerjisi ilə təmin edərkən həm də avtonom fəaliyyət göstərə bilər.

Külək ferması inşaatında önə çıxan ölkə Danimarka olmuşdur: hökumət 1890-cı ildə külək turbinlərinin tətbiqi üzrə geniş bir inkişaf proqramı başlatmışdı. 1910-cu ildə bir neçə yüz belə külək turbinləri istifadəyə verilmişdi. Turbinlərin pərlərinin diametri 23 m olan, 24 m yüksəklikdəki bir qülləyə quraşdırılmış və mexaniki ötürücü ilə qüllənin bünövrəsində yerləşən elektrik generatoru ilə birləşdirilmiş dörd barmaqlı külək çarxları mövcud idi. Generatörün layihə gücü 5 - 25 kVt arasında dəyişdirdi. Bu külək turbinləri tərəfindən istehsal olunan elektrik enerjisinin dəyəri bir dizel elektrik qurğusunun istehlak etdiyi yanacağın dəyərinə bərabər idi.

İkinci Dünya Müharibəsindən sonra Danimarkada, enerji sistemi ilə sinxron rejimdə işləmək üçün nəzərdə tutulmuş, 12, 45 və 200 kVt gücündə üç eksperimental külək turbinlərini hazırlamış və sınaqdan keçirilmişdi. Bu turbinlər 1960-cı ilə qədər fəaliyyətlərini davam etdirmişdi. İstehsal olunan elektrik enerjisinin maya dəyəri bir istilik mühərrikindən alınan enerjinin ekvivalent dəyərindən artıq olduğu üçün layihənin fəaliyyəti dayandırılmışdı.

Postosvet məkanında külək enerjisindən istifadə mühüm dövlət problemi hesab olunurdu. 1924-cü ildə N.V. Krasovskinin rəhbərliyi altında 50 at gücünə qədər çarxın sürətinə nəzarət sistemi ilə təchiz olunmuş yüksək sürətli yeni mühərrik hazırlanmışdı.

Məlumdur ki, külək turbinini layihə edərkən ən çətin və həlledici məqam külək çarxının sürətinin idarə olunmasıdır, çünki şəbəkə ilə paralel iş şərtləri küləyin sürətindən asılı olmayaraq sabit bir generator sürətini tələb edir. Bunun üçün pərin sabit bir ox ətrafında fırlanmasından istifadə olunur. Pərin vəziyyətinin küləyin istiqamətinə görə dəyişməsi ilə, tənzimləmə üçün əsas olan aerodinamik qüvvələr də dəyişir. Pərlərin fırlanması, yuxarıda qeyd edildiyi kimi, təklif olunan pərdə yerləşdirilmiş mərkəzdənqaçma tənzimləyicisinə qoşulmuş bir stabilizator sükanından istifadə edərək ya mexaniki ya da servomotorlar vasitəsilə həyata keçirilə bilər.

1931-ci ildə Sevastopol ətrafında qoyuluş gücü 20 MVt istilik elektrik stansiyası ilə birlikdə 6.3 kV elektrik şəbəkə gərginliyində işləyən Balaklava külək ferması istfadəyə verildi (*şəkil 5.20*). Ölçü baxımından (külək çarxının diametri 30 m, küləyin sürəti 10 m / s, gücü 100 kVt , qüllənin hündürlüyü 25 m, külək çarxının sürəti 30 dövr/dəq) stansiyanın nə əski sovetlər birliyində, nə də ondan xaricdə heç bir anoloqu mövcud olmamışdır [62].

Quraşdırılan generatorun gücü 92 kVt, fırlanma sürəti 600 döv/dəq üç fazlı asinxron mühərrik, və mərkəzdənqaçma mexanizmi ilə avtomatik işə salınma sistemi ilə təmin olunmuşdur. Generator yerləşdirilən qurğunun baş hissəsində uzunluğu *13,7 m, eni 25 m və hündürlüyü* 3,8 m olan kabina quraşdırılmışdır. Külək turbininin *3* növ pəri mövcud olmuşdur.

Külək qurğusunun istismar sınaqları iki rejimdə aparılmışdır: 19 və 30 döv/dəq-də. Eyni zamanda, külək təsərrüfatının 30 döv/dəq ilə işləmə rejiminin daha sərfəli olduğu müəyyən edilmişdir. İllik enerji istehsalı orta hesabla 280 min

kilovat-saat, külək enerjisindən istifadə əmsalı isə 0,32 səviyyəsində idi.



*Şek. 5.20. 100 kVt gücündə olan Balaklava külək stansiuasının ümumi görünüşü [61]*

1935-ci ilin sonunda Moskvada, ümumi şəbəkə ilə paralel işləmək üçün 50 m diametrli külək çarxı və sinxron generator ilə təchiz olunmuş külək ferması layihə olunmuşdu (*şəkil. 5.21*). Fırlanma, külək çarxlarından generator üçün ötürümə əmsalı 1:25 olan iki pilləli ötürücü reduktor vasitəsilə ötürülürdü. Külək çarxının fırlanma surəti 24 dövr/dəq, generatorun isə 600 dövr/dəq təşkil etmişdir. Külək turbininin salonunda generator, hidravlik mufta, qoruyucu qurğular, start və və dayandırma üçün elektrik mühərrikləri ilə təmin olunmuşdur. Elektrik avadanlıqlarının bir hissəsi yarımstansiyada qüllənin bünövrəsində yerləşdirilmişdir.

Külək stansiyasının qoyuluş gücü 1000 kVt olmaqla, üç pərli və əvvəlki aqreqatlardan fərqli olaraq stabil tənzimlənmə sistemi ilə təmin olunmuşdur.

Stansiyda hündürlüyü 50 m qüllə 25X25 ölçülü bünövrənin üzərində quraşdırılmışdır. Qüllənin yuxarı hissəsinə qalxmaq üçün lift və qəza pilləkən quraşdırılmışdır. Qüllənin aşağı hissəsində isə əsas elektrik hissəsinin paylayıcı qurğusu yerləşdirilmişdir.



*Şək. 5.21. Moskvada layihələndirilən KES ümumi görünüşü (1000 kVt) [61].*

4500 kVt gücə malikm daha da güclü külək ferması Ukrayna Sənaye Enerji İnstitutu (USEİ) tərəfindən tərtib edilmişdir (*Şək. 5.22*) [64]. Hündürlüyü 150 m olan metal üçayaqlı bir qüllədə, bütün ötürücü mexanizmləri olan külək fermasının binasını daşıyan oturacaqlar üzərində fırlanan qaynaq olunmuş körpü quraşdırılmışdır. Külək çarxını küləyə qarşı döndərmək üçün körpünün qüllənin oxu ətrafında fırlanması avtomatik olaraq həyata keçirilrdi. Qurğu diametri 80 m olan külək çarxı metal konstruksiyalı dörd qanaddan ibarətdir. Əsas val elastik bir muftanın köməyi ilə dişli ötrücüyə qoşulmuşdur və bu ötrücü dövrlər sayının dəqiqədə 18-dən 612-ə qədər artırmaq imkanına malik olmuşdur. Dişli ötürmə hər biri

2250 kVt gücə malik iki üç fazalı cərəyan generatorunu fırladır. Generatordan, cərəyan sürüşmə kontaktlatrından kabel vasitəsilə yarımstansiya binasına yönəldilir. Tənzimləmə, yağ servomotoru vasitəsilə həyata keçirilir.



*Şək. 5.22. USEİ tərəfindən layihələndirilən gücü 4500 kVt olan KES-nin ümüumi görünüşü [64]*

*Şək. 5.23-də* Yu.V Kondratyuk (A.I. Shargey) tərəfindən hazırlanmış külək stansiyasının ümumi görünüşünü təqdim edir. İki külək turbini eyni qüllənin üzərində yerləşir. Hər biri dörd pər (*şəkil 5.24*) ilə 80 m diametrli bir külək çarxına malikdir. Hər bir külək çarxında sürəti 20-dən 600 dövr /dəqiqəyə qədər artıran bir hidravlik multiplikator, üç fazlı cərəyan generatoru və idarəetmə və tənzimləmə mexanizmləri dəsti mövcuddur. Aşağıdakı qurğu yerdən 65 m hündürlükdə, yuxarıdakı isə qüllənin yuxarı hissəsində, 158 m yüksəklikdə yerləşir.

Hər iki qurğu üçün ümumi olan paylayıcı qurğular və şitlər aşağı hissədə əlavə quraşdırılmış maşın zalında yerləşir. Buradan, 6000 V gərginlikli cərəyan, küləyin istiqamətindən asılı olaraq, bünövrə üzərində döndüyündən, xüsusi dairəvi cərəyan kollektorlardan istifadə olunur.

İş rejimində külək çarxı sərt şəkildə bərkildilmiş əsas valı döndərir. Külək sytansiyası külək sürəti 6 m / s-dən işləməyə başlayır və. 16.5 m / s sürətində 7000 kVt gücə, 20.3 m / s sürətdə isə 10 min kVt gücə sahibdir.




*Şek.5.23. Külək stansiyasının ümumi görünüşü Yu.V. Kondratyuk (A.I. Shargei): 12,000 kVt*

1936-cı ildə Krımdakı Ai-Petrinskayada, vahidinin qoyuluş gücünə görə Dünyada bu günə qədər analoqu olmayan 12 MVt gücündə külək qurğusunun inşasına başlanıldı. Onun gücü ilk Sovet eksperimental nüvə stansiyasının gücündən demək olar ki, iki dəfə çox idi. Bu layihə bu gün bütün dünya mütəxəssislərinin peşəkar maraq mövzusudur. Təəssüf ki, külək enerjisinin inkişafına o dövrlərdə rəhbərlik edən G.K. Orjenikidzenin ölümündən sonra külək fermasının inşası dayandırılmışdı [64].

Artıq qeyd edildiyi kimi, 19-cu əsrin sonlarına qədər ABŞ-da elektrik enerjisi istehsal etmək, suyu yüksəkliklərə qaldırmaq və digər işləri yerinə yetirmək üçün istifadə olunan 8 milyondan çox kiçik külək turbinləri inşa edilmişdir. Bununla yanaşı, bu qurğuların əksəriyyəti 1930-cu ildən başalayaraq ABŞ-ın əksər

tələbatçılarının bilavasitə enerji sistemindən mərkəzləşdirilmiş qayadada təmin edildiyində görə, onların fəaliyyəti dayandılımağa başlanıldı.

ABŞ-da külək enerjisinin inkişafına ən əhəmiyyətli töhfə "Smis-Putnam" külək fermasının yaradılması olmuşdur [65].

1930-cu ildə həyata keçirilən külək turbinləri ölçülərinin onun səmərəliliyinə təsirinin uzun sürən araşdırmalarından sonra Masakuses Texnoloji İnstitunun 1924 –cü il məzunu, mühəndis Putnam belə nəticəyə gəldi ki, istehsal olunan elektrik enerjisinin maya dəyərinin minimuma endirmək üçün böyük ölçülü külək turbinlərinə keçidi təmin etmək tələb olunur. Bu məqsədlə, məşhur aerodinamik Karmanın iştirakı ilə şəbəkədə işləmək üçün yüksək güclü külək turbinini hazırladı. Turbinin İstehsalı "S. Morgan Smith Company" (York, PA), sinxron generator isə "General Electrik" şirkəti tərfindən hazırlanmışdır. Qeyd edək ki, Putnam Balaklavada quraşdırılmış 100 kVt turbin haqqında məlumat əldə etmişdir və bu onu daha güclü qurğunun hazırlanması üçün böyük stimul vermişdir [66].

Külək qurğusu 1940-cı ilin əvvəllərində hazırlandı və sınaqdan keçirildikdən sonra 1941-ci ildə yerli elektrik şəbəkəsinə qoşuldu. Şəbəkə Rutland, Vermont yaxınlığında, Grandpas dağının zirvəsində, dəniz səviyyəsindən təxminən 610 m yüksəklikdə yerləşirdi ( *Şəkil 5.24*).

Külək turbinin qülləsinin hündürlüyü *36 m* olmaqla beton təməldə təqribən *7 m* dərinliyə qoyulmuş bir polad torda quraşdırılmışdır. Diametri *53 m* olan iki pərli külək çarxının uzunluğu *20 m* və eni *3,7 m* təşkil edirdi. *14 m / s* külək sürətində turbinin gücü *1250 kVt*-a çatırdı. Külək çarxı *28.7 dövr/dəq* sürətlə fırlanırırdı.

Turbinin külək istiqamətinə tənzimlənməsi hidravlik mexanizm tərəfindən həyata keçirilirdi. Külək turbinini elektrik mühərriki ilə idarə olunan əyləc cihazı ilə dayandırılırdı.

1941-ci ilin oktyabrından 1945-ci ilin martına qədər bu külək elektrik stansiyası *360 min kVt / saat* istehsal etdi. Bu dövrdə cəmi 1010 saat işlədiyi, bunun 838 saatı elektrik sistemi ilə paralel olaraq orta hesabla 431 kVt güclə fəaliyyət göstərmişdir. 1945-ci ilin mart ayında külək turbinində 7 ton ağırlığında olan külək turbininin pərinin qırılması nəticəsində, qurğu fəaliyyətini dayandırmaq məcburiyyətində qaldı



*Şək. 5.24. BЭС "Smit3Putnem" KES-in ümumi görünüşü (1250 kVt) [66].*

Qəza, idarəetmə sisteminin qeyri-kafi layihəsi səbəbindən baş vermişdi. Qəza II Dünya Müharibəsi dövründə baş verdiyindən təmir üçün lazımi material və işçi qüvvəsinin çəlb edilməsi mümkün olmadığna görə, külək quğusunu bərpa etmək mümkün olmadı və qurğu öz fəaliyyətini dayandırdı.

Qeyd edək ki, ötən əsrin 80-ci illərində qədər ikinci böyük güclü külək turbini quraşdırlmamışdır.

O dövrdə aparılan iqtisadi hesablamalar, bərpa olunan külək turbininin ənənəvi elektrik qurğuları ilə rəqabət dözə bilmədiklərinə görə, külək turbinlərindən imtina olundu. Buna baxmayaraq, Grendpass dağındakı külək turbini qlobal külək enerjisinin inkişafında mühüm mərhələ oldu.

XX əsrin 70-ci illərində məlum enerji böhranının başlanğıcına qədər dünyanın qalan hissəsində kiçik güclü külək elektrik stansiyaları fəaliyyət göstərirdi.

### 5.3.3. Külək qurğularının növləri

Külək qurğularının növləri ilə bağlı qeydlərə keçməzdən əvvəl, külək enerjisinin gücü ilə bağlı qısa məlumat vermək oxucular üçün faydalı olar.

Mlumdur ki, küləyin orta sürəti yer səthindən hündürlük artıqca artır, bu o deməkdir ki, güc də artır. Məsələn, hesablamalara görə yerdən 20 metr yüksəklikdə, güc 5 m hündürlükdə mövcud olandan təxminən 22% çoxdur. 1 $m^3$ havanın kinetik enerjisi (joulla) $0.5pv^2$-ə bərabərdir, burada p - hava sıxlığı (səthdə təxminən 0,12 kq / $m^3$), v - küləyin orta sürəti (m / s ).

Külək gücü (vattla) külək enerjisinin bir məhsuludur, küləyin istiqamətinə perpendikulyar olaraq yerləşən pərlərin sahəsi (A, $m^2$ ilə) və küləyin sürətinin kubu ilə mütənasibdir ($0.5pAV^3$ ). Küləyin gücü küləyin orta surətinin kubu ilə mütənasib olaraq artdığına görə, sürəti ikiqat artıraraq mövcud gücünü səkkiz dəfə artırmaq olar. İlk dövrlərdə nisbətən ağır və zəif qurulmuş külək dəyirmanlarının işləməsi üçün ən az 25 km / saat (7 m / s) sürətlə əsən küləklər lazım idi. Daha aşağı sürətlərdə onlar yalnız yavaş dönürdülər, lakin küləyin sürəti 10 m/s çox olduqda pərlərin sahəsinin azaldırlması məcbuiriyyəti yaranırdı, daha yüksək surətlərdə sahənin azaldılması davam etdirilməli idi. Bu səbəbdən külək aqreqatlarını yalnız məhdud külək dəhlizli gündəlik faydalı iş saatları 5-7 saat təşkil edirdi.

Bütün bu amillər daimi güclü küləklər olan yerlərin üstünlüyünə səbəb oldu. Daha səmərəli, çevik olan güc dəyirmanları yümüşaq ötürmə və yaxşı yağlama sistemləri külək qurğularının işləmə saatının sutka ərzində 10-12 saata

qaldırmağa imkan verdi. Sənaye dövründən əvvəl cəmiyyətlər yalnız yer səthinə yaxın əsən külək axınlardan istifadə edə bilirdilər, və əksər dəyirmanların qanadları 10 metrdən az idi. Külək axınları zaman və məkana görə böyük dəyişkənliyə malik olduqlarına görə, hətta əlverişli ərazilərdə küləyin orta illik sürəti 30% dəyişdiyini nəzərə alaraq, qurğuların yalnız 30-50 metr yerinin dəyişməsi küləyin orta surətinin azalma və ya artması ilə müşahidə olunur.

Qeyd etmək yerinə düşər ki,heç bir qurğu küləyin bütün enerjisini mənimsəyə bilməz, əks halda bu tamamilə külək axınlarının dayandırılmasını ilə nəticələnə bilərdi. Alman mühəndisi Albert Betz-in 1919-cu ildə dərc etdiyi nəzəriyyəyə əsasən, maksimum külək axınının kinetik enerjisinin 60% -i mexaniki enerjyə çevirilə bilər [67]. Real səmərəlilik sənayedən əvvəlki dövrdə quraşdırılmış külək qurğuları üçün 20-30% təşkil etmişdir. XVIII əsrin qüllə dəyirmanı 20 m diametrli bir pərlə, küləyin 10 m / s sürətində nəzəri gücü təqribən 189 kVt olmasına baxmayaraq, real əldə olunan güc 50 kVt-dən az enerji təşkil etmişdi.

Ötən dövr ərzində çox sayda külək generatorları hazırlanmışdır. Fırlanma oxunun külək axının istiqamətinə nəzərən yerləşməsindən asılı olaraq külək generatorlarını aşağıdakı kimi təsnif etmək olar [68, 69, 70]:

- külək axınının istiqamətinə paralel və ya perpendikulayar, üfüqi fırlanma oxu ilə, yəni pərlər yerləşdirilən ox yer səthinə paralel yerləşdirlir;
- külək axınının istiqamətinə perpendikulyar, şaquli fırlanma oxu ilə, yəni pərlər yerləşdirilən ox yer səthinə perpendikulyar çəkildə yerləşdirlir.

Həmçinin, külək enerjisini, hər hansı hərəkət edən mexanizm tətbiq etmədən, elektrik enerjisinə çevirən qurğular işlənmişdir. Bunlara, məsələn, Tomsonun termoelektrik effekti əsasında qurulan külək axınında soyudulma prosesini göstərmək olar. Elecə də, əgər mexaniki enerji birbaşa digər növ enerjiyə,

məsələn su sistemlərində, kənd təssərüfatı məhsullarının emalı üçün tətbiq olunursa, onda bu qurğular *külək dəyirmanları*, elektrik enerjisinə çevirildikdə isə *külək generatoru* adlandırılır.

*Üfüqi fırlanma oxu olan külək turbinləri* (ÜOKT) külək enerjisini çevirmək üçün qaldırma güc və ya müqvimət gücündən istifadə edə bilər (*şəkil 5.25*).




*Şəkil 5.25. Üfüqi fırlanma oxlun külək turbini (Source: Adapted from National Energy Education Development Project (public domain)*

Baxmayaraq ki, ÜOKT-dan fərqli olaraq, şaquli oxlu külək turbinləri (ŞOKT) əsrlər boyu mövcud olmuşdur, onların ümüumi cəhətləri demək olar ki, yoxdur. Bunun da əsas səbəbi onunla bağlıdır ki, ŞOKT-da küləyin surətinin aqreqatın gücünə

təsiri ÜOKT-ə nisbətən daha azdır. Bu səbədən, üfüqi fırlanma oxlu turbinləri daha çox tətbiq olunmuşdur.

Pərlər yerləşdirilən fırlanma oxu yer səthinı paralel olmaqla yanaşı, ox külək axınına paraleldir.

Bəzi ÜOKT küləyin qaldırma modulunda (up-wind, rejimində) işləmək üçün nəzərdə tutulmuşdur (qüllənin pərləri birbaşa küləklə qarşılaşır) (*şəkil 5.26. a*) [68]. Külək turbinlərinin konstruksiyasında istiafdə olunan bu üsul küləkdən enerji əldə olunmasının daha effektivlisi hesab olunur.



*a)* *b)*

*Şəkil 5.26. Üfüqi fırlanma oxlu (a) və şaquli fırlanma oxlu külək turbini [68]..*

Belə ki, bu yanaşmada qüllənin arxa hissəsinin külək kölgəsinin qarşını aılmaqğa imkan verir.Bununla yanaşı, külək kölgəsi qüllənin qabaq hissəsində yaranır. Bunun qarşısının alaınması məqsədilə, rortoru qüllədən uzaqlaşdırmaq tələb olunur ki, bu da böyük vəsait tələb edir.

Bu tip turbinlər hazırda iki- və üç-pərli konstruksiyada olmaqla daha çox tətbiq olunmaqdadır. Bunların qülləsinin hündürlüyü 120 metrə çatdırılmışdır. Böyük külək turbinlərində maşının külək istiqamətinə reaksiyasını təmin etmək üçün motorlu mexanizmlərdən istifadə olunur. Kiçik güclü külək turbinlərində bu funksiyanı quyruq çubuğu yerinə yetirir.

Digər külək turbinləri endirmə (down-wind) rejimində işləyirlər ki, bu halda külək pərləri küləyə müqavimət göstərmirlər, buna görədə külək faktiki olaraq pərlərin arxa hissəsi ilə qarşılaşır (zərbə endirir) və onu hərəkət etməyə məcbur edir (*şəkil 5.26. b*) [68]. Bu üsul rotorun daha çevik hazırlanmasına və bunun nəticəsində, külək kölgəsini azlatmağa və daha yüngül modelin hazırlanmasına imkan verir. Eyni zamanda, külək birbaşa külək kölgəsindən əsdiyinə görə, küləyin gücü dəyişkən olur və bu konstruksiya külək kölgəsini azaltmağa imkan versə də, aşağı təzyiqli belə turbinlərdə külək kölgəsi hələ də kifayyət qədər yüksəkdir.

Diffuzor-Artırılmış (Diffuse-Augmented) külək turbinləri kimi də tanınan üfüqi oxlu kürəkli turbinlər, sistemdəki hava axını artıran bir üzük şəklində ayrodinamik örtüyündə yerləşirlər (*şəkil 5.27*) [68]. Bu layihə ayrodinamik örtükdə yaranan hava axınının artması səbəbindən üfüqi oxlu külək turbinlərinin gücünü 5 qat artıra bilər. Pərlər ayrodinamik örtüklə örtüldüyünə görə, turbinlərdə turbulans və səs-küy də azalır. Lakin, bunlar çox bahalı turbinlər hesab olunur və müasir, yüksək sürətli turbinlərlə rəqabətdə uduzurlar.



*Şəkil 5.27. Kürəkli ÜOKT [68].*

Külək çarxı fərqli sayda pərlə icra oluna bilər; əks çəkili yükü olan bir-pərlidən çox-pərli olan (pərlərinin sayı 50 və ya daha çox) külək generatorlarına qədər. Üfüqi fırlanma oxu olan külək çarxları bəzən istiqamətə görə fiksasiya olunur, yəni küləyin istiqamətinə perpendikulayr olan bir şaquli oxda dönə bilmirlər. Bu tip külək generatoru yalnız bir istiqamətdə üstünlük təşkil edən külək istiqaməti olduqda istifadə olunur.

Əksər hallarda, külək çarxlarının quraşdırıldığı sistem (başlıq adlandırılan) dönər, küləyin istiqamətinə yönəldilmişdir. Kiçik külək generatorlarında, quyruq lələkləri ümumiyyətlə bu məqsəd üçün istifadə olunur; böyük külək generatorlarında idarəetmə sistemləri istiqaməti yönəldir.

*Şaquli fırlanma oxlu külək generatoru*. Belə rotorlar ÜOKT-nə nisbətən vacib üstünlüklərə malikdir. Belə ki, ŞOKT-ı üçün küləyə istiqamətləndirmə




*Şəkil 5.28. Savonius turbinlərinin: a) bütöv pərli, b) bölünmüş pərli [68].*

cihazlarına ehtiyac olmur, layihə sadələşdirilir və pərlərdə, ötürmə sistemində və digər elementlərində əlavə gərginliyə səbəb olan hidroskopik yük azalır. Eyni zamanda, ŞOKT, onların layihəsi ilə bağlı olaraq effektivliyi (frılanma surəti)

ÜOKT-nə nisbətən aşağı olduğuna görə daha az tətbiq olunmuşdur.




Bu cür qurğulara plitələr, kubok şəklində və ya turbin elementləri olan qurğular, həmçinin qaldırıcı qüvvə təsir edən *S* şəkilli pərləri olan *Savonius rotorları* (*şəkil 5.28*) daxildir. Bu tip qurğularda böyük başlanğıc momentə, lakin adi rotorla müqayisədə daha aşağı sürət və gücə malikdir [71, 72].



*a)*

*Şəkil 5.29. Dariye turbini:*
*a) layihəsi*
*b) Kavbek, Canadada quraşdırılmış böyük güclü Dariye turbini [73].*

*b)*

1920-ci ildə Fransada, Dariye 1970-ci ildən başlayaraq üzərində intensiv şəkildə işləməyə başladığı ŞOKT-un yeni bir rotor növü təklif etdi [73]. Hazırda *Dariye külək generatoru* qanad tipli külək generatorlarının əsas rəqibi hesab edilə bilər (*şəkil 5.29)*

Dariye rotoru, qanadın profilinin eninə kəsiyində movcud olan qabarıq pərlərdə qaldırıcı qüvvədən istifadə edən külək

generatorlarına aiddir [73,74]. Rotor nisbətən kiçik başlanğıc momentinə malikdir və buna görə yüksək sürət, kütlə və ya dəyərə düşən xüsusi güc böyük olur. Belə rotorlar bir, iki və ya daha çox fərqli pər formalara (Φ-, Δ-, Y- və romb şəkilli) malikdir. Turbinin pərləri yüngül və eyni zamanda kifayət qədər möhkəm olmalıdır. Onlar ağac, polad və ya optic - şüşə kimi süni materiallardan hazırlanır.






*Şəkil 5.30. Giromil ŞOKT-nin görünüşü [68].*

ŞOKT-in bir növü, *Giromil tipli külək turbinləridir (şəkil 5.30)* . Onlar, ümumiyyətlə mərkəzi oxa birləşdirlmiş iki və ya üç şaquli aerodinamik pərlərlə icra olunur. Giromill turbinləri qiymətcə ucuzdur və turbulent külək şəraitində yaxşı işləyir, lakin enerji istehsalına görə ÜOKT ilə rəqabət qabiliyətli deyil [68].

*Şəkil 5.31*-dən göründüyü kimi, ŞOKT-nin növlərindən biri olan *çırpma panelli turbinlərin* pərlərinə külək istənilən istiqamətdən daxil ola bilər. Bu halda külək turbini eyni şəkildə fəaliyyət göstərəcək [68].

Hazırda, yuxarıda qeyd olunanlarla yanaşı, hər gün yeni dizaynlı turbinlər təklif olunur, hətda pərsiz külək turbinlər belə hazırlanmışdır. Lakin, global güclü rəqabət mühütində, yalnış iqtisadi cəhətdən daha effektiv olan qurğular "yaşamağa vəsiqə" alır.



Müasir külək generatorları daha məhsuldardır. İstehsal olunan elektrik enerjisinin miqdarı küləyin gücü və pərlərin sahəsi ilə düz mütənasibdir. Məsələn, pərlərin sahəsini ikiqat artırmaqla dörd qat daha çox elektrik enerjisi hasil edə bilərik.

*Şəkil 5.31. Çlrpma panelli ŞOKT*




Kiçik və orta ölçülü külək turbinləri adətən ada və ya kiçik ucqar yaşayış məntəqələrini elektrik enerjisi ilə təmin olunmasında istifadə olunur. Məsələn,ABŞ-da Massachusetts sahillərində yerləşən Cattihank adasında bir külək generatoru iki

yüz nəfərin - adanın bütün əhalisini təmin etmək üçün kifayət qədər enerji istehsal edir.

Hazırda ABŞ, ÇXR Böyük Britaniya, Danimarka və Kanadada vahidinin gücü 9 MVt-dən çox elektrik gücü olan külək turbinləri istehsal olunur. Dünyanın ən böyük külək generatoru; Vestas şirkəti tərəfindən hazırlanan vahidinin gücü 9,5 MVt təşkil edən V164 tibli külək turbini hesab olunur [75]. GE şirkəti vahidinin gücü 12 MVt olan Haliade – X tipli dəniz və okean sularında quraşdırıması üçün dünyanın ən böyük külək turbinini təqdim etmişlər [76]. Bu turbinin hündürlüyü 260 metr, rotorunun diametri isə 220 metr təşkil edir. Belə bir ədəd aqreqat orta hesabla il ərzində 67 miliyon kVts elektrik enerjisi istehsal etməyə imkan verir.

Eyni zamanda, qeyd etmək lazımdır ki, külək energetikasının vahidinin gücünü artırmaq yolu ilə inkişaf etmə ehtimalı azdır. Əksinə, gələcək istehsal və istismar üçün daha rahat olan orta ölçülü turbinlərə aiddir. Müasir külək generatorlarının nə qədər böyük və güclü olmasına baxmayaraq, onlar hələ də böyük şəhərlərin ehtiyaclarını tam ödəyə bilmirlər. Kiçik külək parkları dünyanın bir çox ölkələrində uğurla fəaliyyət göstərir. ABŞ-da, məsələn, bir çox fermanın və kiçik şəhərlərin əlçatmaz ərazilərində yerləşdirilməsi üçün 1,5 kVt--lıq külək generatorunun inşası ciddi şəkildə təşviq olunur. Almaniyadakı Şimali Fris adalarından birində uzun illərdir dəniz suyunu duzsuzlaşdıran qurğu fəaliyyət göstərir və hətta Pelvorm adasında fərqli külək turbinlərinin sınaqları üçün bir sınaq sahəsi yaradılmışdır. Təcrübə göstərir ki, onlardan istifadə dizel mühərriklərindən istifadə ilə müqayisədə 4 dəfə, suyu maşınlarla daşınmasından isə 10 dəfə ucuzdur.

Yuxarıda qeyd olunanlarla yanaşı, küləyin gücünün qeyri – sabit olması, davamlı elektrik enerji təchizatının təmin olunmsı üçün onun akumlyasiya olunmasının tələb edir. Lakin,

mövcud akumlyasiya sistemləri kifayət qədər bahalı olduğuna görə kiçik güclü külək turbinləri üçün daha effektli hesab olunur. Bu səbədən külək enerjisini istehsal olunan məhsulun özündə akumlyasiya etmək daha məqsədəuyğun hesab olunur. Bütün bunlar, məhz külək turbinlərinin kənd təssərüfatı sahələrində tətbiqinin effektivliyini artırır.

Külək turbinlərinin üstünlüklərindən biri də odur ki, onlar bizim ehtiyaclarımıza uyğun (unison) olaraq hərəkət edirlər. Məlumdur ki, Dünyanın əksər bölgələrində ən güclü küləklər adətən payızda və qışın əvvəlində - insanın ən çox işıq və istiliyə ehtiyac duyduğu zaman müşahidə olunur. Əksinə, sakit küləklər - əsasən yayda – nisbətən az enerji istehlakı dövrlərinə təsadüf edir (təbii ki, məişət istehlakı haqqında danışırıq). Ancaq bu və digər üstünlüklər əsas çatışmazlığa nisbətən solğun görünür: külək turbininin gücünü artırmaq üçün pərlərin ölçüsünü artırmaq, yəni konstruksiyanın çəkisini daha da artırmaq tələb olunur. Bu halda, külək generatorunun işləməsi üçün daha da böyük külək sürəti tələb ediləcəkdir, yəni qurğunun tətbiq sahələri daralacaqdır.

### 5.3.4. Külək turbinləri texnolojiyasının inkişaf etdirilməsində elmin töhfəsi

İlkin mərhələdə külək turbinlərinin inşaası yalnız uzun illər əldə edilmiş təcrübəyə əsaslanırdı. Mütəxəssislər sonrakı nəsillərə kitablar vasitəsi ilə deyil, praktiki işlərlə öyrədirdilər. Qurğuların forma və sınaq metodlarının təkmiləşdirilməsi, hər hansı bir uğurun əldə olunması başqalarına nümunə olurdu və tədricən təcrübə bazasını zənginləşdirirdi.

XVIII əsrdə Avropada maşınqayırma istehsalı sahəsinin meydana gəlməsi elmin və ixtiranın inkişafına təkan verdi, küləkdən istifadə probleminin həllində elmi yanaşmanın meydana gəlməsinə şərait yaratdı.

Təcrübələrdən nəzəri nəticələrə keçid XVIII əsrin əvvəllərinə təsadüf edir. Yer atmosferinin xassələri havadakı cisimlərin hərəkətinə güclü təsir göstərdiyindən XVIII əsrin ortalarında böyük rus alimi M.V. Lomonosovun (1757-1765) atmosfer fizikası və meteorologiya sahəsindəki tədqiqatları küləyin istifadəsi probleminin həllində mühüm addım oldu [77, 78, 79, 80]. XIX əsrin sonlarında meteorologiyada riyazi və təcrübi metodların tətbiqinin təşəbbüskarı, Peterburq Elmlər Akademiyasının müxbir üzvü A.V. Klossovskinin (1846–1917) təşəbbüsü ilə Rusiyada artıq meteoroloji müşahidə şəbəkəsi fəaliyyət göstərirdi. Külək turbini nəzəriyyəsinin daha sistemli bir şəkildə meydana çıxması da bu dövrə təsadüf edir [81].

Elm və texnikanın sonrakı inkişafı üçün N.E. Jukovski (1847–1921), S.A. Çapliqin (1869-1942), L. Prandtl (1875-1953) və bir çox digər mexanika üzrə alimlər qanad, hava vinti və sərhəd təbəqəsi nəzəriyyəsi (1904, 1905, 1910) həlledici əhəmiyyətə malik olmuşdu [82, 83].

1905-ci ildə N.E. Jukovski, qaldırıcı qüvvənin meydana gəlməsi mexanizmini kəşf etdi və məşhur "Bağlı şüalar üzərində" əsərində bu qüvvənin kəmiyyətcə təyin olunması üçün teoremi isbat etdi. Bu tədqiqatlar bir elm olaraq aerodinamikanın əsasını qoydu.

Təcrübə (eksperimental) metodunun geniş miqyasda mexanikaya tətbiqi N.E. Jukovski və K.E. Tsiolkovskinin (1857–1935) böyük xidmətləri olmuşdur. Rusiyada ilk olaraq külək tunelləri yaradıldı.

902-ci ildə N.E. Jukovski Moskva Universitetində Avropada ilk sorma tipli külək tunellərindən birini inşa etdi. 1910-cu ilə qədər dünyada ilk üç aerodinamik institut fəaliyyət göstərdi - Romada, Amerikada və Rusiyada.

N.E. Jukovsky və S.A. Chaplygin əsərlərinin 1910-cu ildə meydana çıxmasından sonra qanad nəzəriyyəsinin sürətli inkişaf dövrü başlayır [68,69].

*Serqey Alekseevic Çapılqin (1869–1942)*



N.E. Jukovskinin "Bağlı çuxurlarda" və "Təyyarələrin dəstəkləyici səthlərinin konturlarında", S.A. Chaplyqin "Tıxanan cisimlərə təyyarə-paralel axının təzyiqi haqqında" və "Monoplan qanadının ümumi nəzəriyyəsi haqqında" işləri mahiyyətcə qanad profilinin sıxılmayan qazda işləməsi haqqında bütün əsas məlumatları ehtiva edir.

Elmin bu qədər sürətli inkişafına səbəb olacaq və uzun illər aerodinamikanın mərkəzində Jukovski və Çapliqinin olmuşdur. Qanad və vint nəzəriyyəsi ilə bağlı bütün araşdırmalar bir növ bu işlər ilə bağlı olmuşdur.

1912-ci ildə N.E. Jukovski tərəfindən "Aeronavtikanın nəzəri əsasları" əsəri nəşr olundu. Kitab xarici alimlər tərəfindən yüksək qiymətləndirilmiş və 1916-cı ildə Parisdə fransız dilinə tərcümə edilmişdi.

Aviasiyanın inkişafı, bunun böyük uğuru aerodinamikanın yaradıcısı, ən böyük rus alimi N.E. Jukovski, külək enerjisindən istifadənin nəzəri məsələlərini yeni şəkildə həll üçün şərait yaratmışdı.

1914-1918-ci illərdə. N.E. Jukovski və tələbələri V.P. Vetchinkin, G.X. Sabinin, N.V. Krasovski, G.F. Proskura və başqaları ilk dəfə külək turbinlərinin nəzəriyyəsini yaratdılar.

Təyyarənin qanad və vint nəzəriyyəsi və sınaqları, külək çarxından hava axını nəticəsində baş verən hadisələrin öyrənilməsinə tətbiq olunmuşdu.

İdeal külək çarxı nəzəriyyəsi ilk dəfə 1914-cü ildə V.P. Vetkinkin (1888-1950) ideal vint nəzəriyyəsinə əsaslanmışdır. Bu işdə, O, ideal külək çarxının külək enerjisindən istifadə əmsalı anlayışını əsaslandırmışdı.



*Nikolay Eqoroviç Jukovski (1847-1921)*

1920-ci ildə N.E. Jukovski "NEC tipli külək dəyirmanı" nəzəriyyəsini ortaya qoydu. Oxşar nəzəriyyələr sonradan digər alimlər təfəindən də hazırlanmışdır.

N.E. Jukovskinin ideal külək turbinlərinin nəzəriyyəsi klassik nəzəriyyə adını aldı. Bu nəzəriyəyəy uyğun olaraq o, külək enerjisindən ideal bir külək çarxı ilə istifadənin maksimum əmsalı 0,593 olduğunu təyin etdi [84].

Praktik tətbiq nöqteyi-nəzərindən daha dolğun olan ideal külək çarxı nəzəriyyəsi professor G.X. Sabinin tərəfindən işlənildi.. Onun nəzəriyyəsinə görə, külək enerjisinin bir külək çarxı ilə maksimum istifadəsi 0.687 təşkil edir [85, 86, 87].

Dünyada külək turbinləri aerodinamikası ilə məşğul olanlar az idi: Almaniyada Göttingen aerodinamik və sınaq laboratoriyasının müdiri doktor Albert Betz və Ştutqart Universitetinin professoru Ulrich Hütter [88] və ABŞ-da məşhur aerodinamik Teodor fon Karman (1881-1963) [89].

W. Hutter, külək enerjisi sahəsində onlarla ixtiraya patent aldı və onlarla elmi məqalə və məruzə nəşr etdirdi. Pərlərə tüstü bomba və ya iz qoyan eksperimentlər texnikasını inkişaf etdirdi.

və ilk dəfə tədqiqatda tətbiq etdi. Bir külək pərinin birinin sonluğunda tüstü bomba işə salındıqda elektrik cərəyanı tərəfindən alovlanaraq dönmə müstəvisindən kənarda uzanan spiral tüstü izi tərəfə bir foto, film və ya video film çəkilmişdir (*şəkil 5.32*). Şəkillərin deşifrə edilməsi, bir hava qülləsində



*Şek. 5.32. Külək təkərinin bıçaqlarından birinin ucuna quraşdırılmış tüstü bombalarının izi [88].*

küləyin sürətinin qeydə alındığı zaman müəyyən nöqtələrdə külək çarxının səmərəliliyini qiymətləndirməyə imkan verdi [88].

Külək enerjisindən istifadənin nəzəri əsaslarının yaradılması ixtiraçıların və layihəçilərin işlərini gücləndirdi.

1925-ci ildə Fransada və 1926-cı ildə ABŞ-da Darie külək turbinini patentləşdirdi. 1926-cı ildə fin mühəndisi Savonius rotor və ya dönər külək turbinini hazırladı.

1930-cu illərin əvvəllərində, böyük güclü külək ferması köhnə SSRİ-də ilk dəfə inkişaf etdirildi. Bundan əvvəl dünyada belə stansiyaların gücü 100 kVt-dan çox olmamışdı. 1932-ci ildə Yu.V. Kondratyuk (1897-1941, super güclü bir külək fermasının layihəsi üçün yarışmada iştirak etdi.).

1933-cü ilin aprel ayında külək təsərrüfatı layihələrinin müayinəsi Yu.V. Kondratyuk və Ukrayna Sənaye Enerji İnstitutunun dizayn layihələrinin qələbəsi ilə başa çatdı [64].

Sovet İttifaqında professor V.N. Andrianovun rəhbərliyi altında, külək təsərrüfatlarının qeyri-külək elektrik stansiyaları və enerji sistemləri ilə paralel işləməsinin əsas problemləri nəzəri cəhətdən inkişaf etdirilmiş və eksperimental olaraq təsdiq edilmişdir. Professor E.M  Fateevanın rəhbərliyi altında aqreqasiyanın əsasları və külək turbinlərinin səmərəli işləmə metodları araşdırılmışdı.

XX əsrin 30-cu illərinin ortalarında dünya birliyi artıq külək turbinləri pərləri üçün yüksək keyfiyyətli aerodinamik profillərə sahib idi, bunlar da külək turbinlərinin müxtəlif modellərinin yaradılmasını mümkün etmişdi. Bu nailiyyətlər, bir sıra elmi qurumlar tərəfindən külək quğularının hesablanması və layihə üsullarının işlənib inkişaf etdirilməsi və dünya külək mühəndisliyinin inkişafı istiqamətində yaxşı bir zəmin yaratmışdı.

## 5.4. ƏTRAF MÜHÜT VƏ KÜLƏK ENERGETİKASININ PERESPEKTİVLƏRİ

Hazırda, ekoloji problemlər tədricən bəşəriyyətin əsas narahatlıqlarından birinə çevrildiyi zaman müxtəlif enerji mənbələrindən istifadə yalnız güc və iqtisadi səmərəlilik

baxımından deyil, ətraf mühitə təsiri baxımından da böyük əhəmiyyət kəsb edir.

İlk baxışdan, deyə bilərik ki, külək enerjisi tamamilə ekoloji cəhətdən təmizdir və təbiətə və insanlara zərər vermir. Həqiqətdə isə belə deyil. “Statista” agentliyinin məlumatına əsasən 2019-cu ilinin sonuna quraşdırılmış külək elektrik stansiyalarının ümumi gücü 650 GVt-ı ötmüş, qurğuların dünya üzrə sayı isə 340 min ədəddən çoxdur [90]. Bu yüz minlərlə külək turbinlərin formalaşdığı güclü külək parkları bir çox problem mənbəyinə çevrilmişdir: ağlasığmaz səs-küy yaratmaqla , radio və televiziya yayımlarına maneələr yarada bilir. Bundan əlavə, nəhəng qüllələr əksər hallarda quşların mövsümü miqrasiyasına mane olur. Əlbəttə ki, istilik elektrik stansiyalarının təbiətə vurduğu böyük ziyanla müqayisədə külək qurğuları tərəfindən yaradılan ziyanlar nəzərəçarpan səviyyədə deyil. Eyni zamanda, gələcəkdə tamamilə "təmiz" enerji əldə etmək istəyiriksə, külək turbinlərinin ətraf mühitə təsiri problemləri bu gün həll edilməlidir. Bu həllərdən biri və ən perspektivlisi - sahildən çox məsafədə açıq dənizdə (offshore) külək generatorları quraşdırmaqdır. Bu, təkcə təhlükəsizliyi deyil, həm də səmərəliliyi artıracaq, çünki okeanların geniş ərazilərində külək potensialı daha yüksəkdir. Əlbəttə, açıq dəniz sularında külək generatorlarının quraşdırılması və sistemə inteqrasiyası quruda tikilən stansiyalara nisbətən, orta hesbala iki dəfə çox kapital qoyuluşu tələb edir. Lakin, külək enerjisindən istifadə əmsalının təqribən 1,5 dəfə yüksək olması (>58 %) və ekoloji xərclər də nəzərə alınmaqla, offshore külək stansiyaları iqtisadi cəhətdən səmərəli hesab olunur [91].

Qeyd etmək yerinə düşər ki, Qlobal Külək Enerjisi Şurasının (GWEC – Global Wid Counsil) məlumatına əsasən təkcə 2019-cü ildə global səviyyədə offshore külək sənayesi 6,1 GW yeni generasiya mənbələri daxil edilmiş və bu ötən ilin müvafiq səviyyəsini 35 % üstələmişdir. 2020-ci ilin əvvəlinə dəniz və oken sularında quraşdırılan külək stansiyalarının

ümumi gücü artıq 29 GW-a çatdırılmışdır. Eyni mənbənin məlumatına görə 2024-ci ilə qədər əlavə 50 GW gücün istismara təhvil verilməsi planlaşdırılır [76]. Azərbaycan Respublikası Alternativ və Bərpaolunan Enerji Mənbələri üzə Dövlət Agentliyinin məlumatına əsasən, Xəzər dənizinin Azərbaycana aid hissəsində külək potensialı 10000 MVt-dan çoxdur və bu böyük həcmdə elektrik enerjisi istehsalı üçün əlverişli şərait mövcuddur.

Artıq qeyd edildiyi kimi, külək enerjisindən istifadənin əsas problemi küləyin qeyri – sabit olmasıdır. Külək olmayan günlərdə enerjisinin akumlyasiya olunmasının müxtəlif üsulları mövcuddur. Bunlardan ən sadəsi, biri digərinin aşağı hissəsində yerləşən iki su anbarı sistemini yaratmaqdır. Küləkli günlərdə istehsal olunan elektrik enerjisi aşağıda yerləşən su anbarından yuxarıya suyu vurmaq üçün istifadə edilə bilər. Külək generatorunun fəaliyyəti mümkün olmadıqda isə yuxarı su hövzəsində yığılan suyun enerjisindən istifadə etmək mümkündür. Bu halda su yuxarıdan aşağı hövzəyə daxil olacadır. Akumlyasiyanın başqa bir üsulu, suyun elektrolizi üçün külək enerjisindən istifadə olunasıdır - sudan hidrogen və oksigen istehsal olunur. Məlumdur ki, hidrogen hər hansı bir yanacağı əvəz edə biləcək ideal bir yanacaqdır. Yanma istiliyi təbii qazla müqayisədə 3,6 dəfə yüksəkdir. Küləkli günlərdə kifayət qədər hidrogen tədarük etsəniz, qaz boru kəmərləri ilə istənilən yerə nəql edilə və sonra istilik elementlərində istifadə oluna bilər. Bu texnolojiya ilə bağlı növbəti Fəsildə daha geniş məlumatlar təqdim olunur.

Aparıcı institutların hsablamalarına görə, yer kürəsinin ümumi külək enerjisi potensialı dünya üzrə illik elektrik istehlakından təqribən 30 dəfə yüksəkdir. Əlbəttə, bütün bu enerji ehtiyatından istifadə edilə bilməz. Normal külək turbinləri üçün hava axınının sürəti orta hesabla *3 m / s*-dən az və *50 m / s*-dən çox olmamalıdır. Bununla birlikdə küləyin maksimal sürəti daha yüksək ola bilər. Amerikalı mühəndislər

karusel kimi fırlanan şaquli rotorlar olan generator hazırlanmışdır. Səmərəliliyi baxımından pərli generatorlarından təxminən üç dəfə üstündür və hətta qasırğa küləklərinə də dözə bilir [92-97]. Göründüyü kimi, texnologiyanın inkişafı ilə daha qabaqcıl layihələr ortaya çıxacaq. Çox güman ki, texnologiya külək turbinlərinin vahidinin qoyuluş gücünün artırılması istiqamətində inkişaf etdirilməyəcək. Gələcək kənd təsərrüfatı və kiçik yaşayış məntəqələrinin ehtiyaclarını qarşılayacaq gücü *5* ilə *100* kilovatt gücündə olan külək generatorlarına məxsusdur. Bununla yanaşı, mövcud enerji sistemlərinin bir hissəsi olaraq elektrik enerjisi istehsal edəcək daha güclü (15 meqavata qədər) stansiyalardan istifadə etmək imkanı mövcuddur. Bundan əlavə, külək enerjisi kübrə istehsalında, havalandırma üçün su anbarlarına göndəriləcək sıxılmış havanın istehsalında istifadə edilə bilər - sakinlər üçün lazım olan oksigen miqdarını artırmaq üçün.

## 5.5. GEOTERMAL ES

Bərpaolunan enerji mənbələri arasında onun istehsalı üçün olduqca spesifik və ekzotik üsullar mövcuddur. Hazırda daha çox tətbiq olunmuş günəş və küləkdən əlavə müəyyən şərtlərdə planetin daxili istilik ehtiyatları istifadə məqsədilə, geotermal elektrik stansiyaları (GeoES və ya GeoİES) yaradılır. Onların işi təbii isti su ehtiva edən yeraltı hövzələrdən gələn buxar enerjisinə əsaslanır. Başqa sözlə, bu tip elektrik stansiyalarında adi yanacaqla işləyən İES-dən fərqli olaraq, buxar generatorunun rolunu buxarlandırıcı-separator tipli istilik-güc aparatı yerinə yetirir. Bu aparatda temperaturu 80-100 $^{0}$C-dən 160-200 $^{0}$C-dək olan nəm buxar alınır. Bu buxarın axını turboaqreqatın pillələrindən keçərək kondensatora daxil olur. Daha sonra buxar kondensatı təsərrüfat ehtiyacları üçün istifadə olunur və ya su hövzələrinə atılır.

Yerin dərinliklərində suda toplanmış istilik enerjisi mürəkkəb mənşəyə malik olur və geoloji quruluşdan, eləcə də süxurların tərkibindən və maqmatik proseslərdən və s. asılı olur. Geotermal energetika üzrə məşhur mütəxəssis olan İ. M. Dvorovun nəzəriyyəsinə əsasən dərinlikdəki süxurların temperaturu təqribi olaraq aşağıdakı formula ilə hesablana bilər [98]:

$$t = \frac{t_h + (H + h)}{\sigma}, \text{°C} \qquad (5.1)$$

Burada $t_h$ - hər hansı bir bölgədəki hava temperaturu, °C;

$H$ – temperaturun müəyyənləşdirilməsi üçün dərinlik, m;

$h$ – sabit temperatur təbəqəsinin dərinliyi, m;

σ - həndəsi pillə, yəni metr ölçü vahidinə əsasən dərinləşməyə müvafiq olan həcm. Dərinləşən hər bir metrdə temperatur 1°C artır; dərinlik orta hesabla 33 metrə bərabər olur.

Planetimizin istənilən yerində müəyyən dərinliklərdə müxtəlif geoloji və iqlim xüsusiyyətlərindən asılı olaraq termal sularla zəngin olan dağ süxur təbəqələri yerləşir. Onların temperaturu və mineral tərkibi geniş diapazonda dəyişir. *Cədvəl 5.1*-də temperaturundan asılı olaraq bu suların xarakteristikası verilmişdir.

Bəzi yerlərdə yerin altından quyu boruları vasitəsilə 200 $^0$C və daha artıq temperaturda qızışmış buxar çıxır. Lakin belə yerlər o qədər də çox deyil. Məsələn, Rusiya ərazisindəki Kamçatka və ya Kuril adalarını misal göstərmək olar.

Azərbaycan Respublikasında əksər termal suların temperaturu çox yüksək olmasa da onlardan istifadə perspektivli hesab olunur. Müxtəlif ərazilər üzrə termal suların temperaturu 30-110 °C arasında dəyişir. Ölkə üzrə ən perspektivli ərazilər Kür çökəkliyi, Qusar dağətəyi zonası və Abşeron yarımadası hesab edilir. Ümumilikdə ölkə üzrə termal suların potensialı 245.6 min m$^3$/gün həcmində qiymətləndirilir.

Azərbaycan ərazisində 11 geotermik zona mövcuddur. İlkin araşdırmalar bu zonalar üzrə termal sulardan istifadənin iqtisadi cəhətdən səmərəli olduğunu və ekoloji tarazlığın bərpa olunmasına mühüm rol oynaya biləcəyini göstərmişdir. Azərbaycan üzrə geotermal potensialın daha yüksək olduğu bir

*Cədvəl 5.1*

*Termal suların xarakteristikası*

| Suların xarakteristikası | Temperaturu, °C | Suların xarakteristikası | Temperatur, °C |
|---|---|---|---|
| **1. Soyuq:** | | **2.2.Potensiallı** | 50 - 75 |
| **1.1.Həddən artıq soyuq** | < 0 | **2.3.Yüksək potensiallı** | 75 - 100 |
| **1.2.Çox soyuq** | 0 - 4 | **3. Yüksək termal:** | |
| **1.3.Soyuq** | 4 - 20 | **3.1.Zəif qızmış** | 100 - 150 |
| **2. Termal:** | | **3.2.Çox qızmış** | 150 - 250 |
| **2.1.Aşağı potensiallı** | 20 - 50 | **3.3.Həddən artıq qızmış** | 250 > |

sıra ərazilər müəyyənləşdirilmiş və geotermal energetika sahəsində işlərin aparılmasının məhz bu ərazilərdən başlanması məqsəduyğun sayılır. Belə ki, Kürdəmir rayonu Carlı ərazisində və Xəzəryanı-Quba ərazilərində geotermal enerji yataqlarının enerji məqsədləri üçün uyğun olması barədə ilkin əsaslandırmalar mövcuddur. Ötən əsrin ikinci yarıısnda bu ərazilərdə qazılmış quyulardan çıxan suyun yer səthində temperaturu 80-85 °C olmuş lakin sonrakı dövrlərdə həmin quyular müxtəlif səbəblərdən istismardan çıxarılmışdır.

Ölkəmizdə geotermal enerjidən sənaye, kənd təsərrüfatı, məişət, kommunal sahələrdə və təbabətdə geniş istifadə olunma perspektivləri mövcuddur.

Termal sulara malik olan bir çox dünya ölkələrində bu enerji mənbəyindən kifayət qədər geniş istifadə olunur.

GeoİES-in texnoloji sxemi bir çox faktorlardan asılıdır: istilikdaşıyıcısının temperaturundan, onun minerallaşma və digər qatqılarla çirklənməsi səviyyəsindən, quyudan elektrik stansiyasınadək olan məsafədən, işlənmiş su tullantılarından istifadə olunmasından, istilik istehlakçılarının tələbatından və s. Bir çox ölkələrin (İtaliya, İslandiya, ABŞ) təcrübəsində üç növ istilik sxemindən istifadə olunur:

1. Bilavasitə təbii buxardan istifadə olunmaqla fəaliyyət göstərən GeoİES;
2. Buxaryaradıcı qurğulu GeoİES;
3. Ayrılmış buxarla işləyən GeoİES.

Bu sxemləri nəzərdən keçirmədən öncə qeyd etmək lazımdır ki, geotermal sular duzlarla və qazlarla zəngin olur. Buna görə də termal mənbələrin işlənməsində bu maddələrə qarşı dayanıqlı olan xüsusi metallardan və örtüklərdən istifadə olunması zərurətini yaradır.

GeoİES-in sxeminin birinci variantından quyudan (su-buxar qarışığı deyil) quru buxar çıxdığı zaman istifadə olunur. Lakin belə hallara (ən azı 1000 metrədək olan dərinliklərdə) çox az rast gəlinir. Belə sxem olduqca sadədir: müvafiq parametrlərə malik olan buxar (5-20 atm və 200-250 $^0$C) bilavasitə turbinin axın hissəsinə daxil olur. İşlənmiş buxar qarışıq tipli kondensatora atılır, su-kondensat qarışığı isə yaxınlıqdakı su hövzəsinə və ya istifadə edilmiş quyulara axıdılır. Tərkibi minerallarla zəngin olan istilik daşıyıcısı turbinin detalları ilə (pərləri, diafraqmaları, labirint kipləşdiriciləri, qoruyucu və bağlayıcı klapanlarla, val və s. ilə) bilavasitə təmas etdiyi üçün onlar karroziya və erroziyaya məruz qalırlar. Sadə İES-lərdən fərqli olaraq bu stansiyaların turbinləri daha tez-tez təmizlik, profilaktika və təmir üçün dayandırılır. Bu işlər isə müəyyən xərclər və itkilər ilə əlaqədar olur. Lakin buna baxmayaraq belə

sxem elementar olaraq sadə və maliyyə tutumu cəhətdən az xərc tələb edən sistemdir.

GeoİES-in digər tipinin fərqləndirici xüsusiyyəti onun buxar alınma sxeminə malik olmasıdır. Burada buxar və su-buxar qarışığı bilavasitə quyunun yanında səthli istilik mübadiləsi qurğusunun borulararası hissəsinə daxil olur və buraya daxil olan qidalandırıcı suyu (müvafiq emaldan keçdikdən sonra) buxarlandırır. Alınan buxar turbinə, sonra isə eyni ilə qarışıq tipli kondensatora verilir. Kondensatın geriyə dövriyədə istifadə olunması üçün saxlanılması zərurəti yarandıqda tsikldə borulu kondensator tətbiq edilir ki, bu da soyuducu su ilə bağlı olan xərcləri əhəmiyyətli dərəcədə artırır.

Nəhayət, üçüncü tip GeoİES-lər digər iki stansiyadan onunla fərqlənir ki, burada geotermal suyun (flyuidin) çıxışında xüsusi nəmayırıcı qurğu quraşdırlır. Bu qurğunun vəzifəsi onun adında göründüyü kimi buxarı sudan ayırmaqdır. Daha sonra su (əgər digər məqsədlər üçün, məsələn, isitmə və ya texnoloji ehtiyaclar üçün istifadə olunmursa) su hövzəsinə və quyuya axıdılır. Aşağı parametrli (2-5 at və 100-120 $^{0}$C) quru buxar isə turbinə yönəldilir. Bu buxarın kifayət qədər təmiz olmasını nəzərə alaraq ona xüsusi profilaktik tədbirlərin görülməsi tələb olunmur. Bu sxemlə XX əsrin 60-cı illərində inşa olunmuş Rusiyanın Kamçatka vilayətindəki Paujet GeoİES-i fəaliyyət göstərir. Bu bölgədə ümumi olaraq dərinliyi 220 metrdən 480 metrədək olan 21 quyu qazılmışdır. Bu quyuların hər birinin debiti saniyədə 10 kq flyuid, istilik tutumu 170 kkal/kq, temperaturu isə 150-dən 200 $^{0}$C-dək təşkil edir.

# FƏSİL VI

# SABAHIN ENERGETİK İMPERATİVLƏRİ

## GİRİŞ

Bu günə qədər dünya iqtisadiyyatının və energetika sektorunun gələcək inkişafının ehtimal olunan istiqamətlərinin qiymətləndirilməsinə həsr olunmuş çox sayda təhlillər mövcuddur.

Daha balanslaşdırılmış hədəf proqnozları, Birləşmiş Ştatların Prezident Administrasiyasının Enerji Məlumat Xidməti, beynəlxalq analitik mərkəzlər - Beynəlxalq Enerji Agentliyi – İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (OECD) Məsləhət və Analitik Mərkəzi, Neft İxrac Edən Ölkələr Birliyi (OPEK) Katibliyi, böyük beynəlxalq maliyyə təşkilatlarının analitik xidmətləri – Beynəlxalq Valyuta Fondu (İVF), Dünya Bankı, Avropa yenidənqurma və inkişaf Bankı tərəfindən hazırlanmış ixtisaslaşdırılmış məsləhət və təhlillər hökumət təşkilatları tərəfindən davamlı olaraq hazırlanır.

Yaxın gələcəkdə əlçatan, etibarlı və təmiz enerji mənbələrinə qlobal tələbatın artmağa davam etməsi, dünyada bir sıra ölkələrin aşağı karbonlu enerji sistemlərinə keçməsi tendensiyasını şərtləndirmişdi. Ehtimal olunur ki, hələ də neftə və təbii qaza olan tələbatın ən yüksək həddinə şahid olmamışıq. Eyni zamanda, son on ildə enerji bazarının dinamikası ciddi dəyişməyə məruz qamışdı. OPEC, bazar payını qorumağa diqqət etsə də ABŞ-da şist nefti yeni və çevik tədarük mənbəyini çevrilmişdi. Sürətli sənaye dinamikasını nəzərə alaraq, qısamüddətli perspektivdən kənarda proqnoz vermək getdikcə çətinləşsə də, bu məsələ həmişəkindən daha vacibdir.

Mühəndislər ixtiraçılıqda, şirkətlər bazarda rəqabət aparır və nəticədə sənaye daim elektrik yeniliklərini təklif edir. Yeni bir maşının ortaya çıxması sürətli bir proses deyil, düşünmək, layihələndirmək, prototiplər hazırlamaq və çox saylı nəzarət strukturları tərəfindən təsdiqlənməlidir. Bəzi gələcək yeniliklər hələ də elmi axtarış və tədqiqat mərhələsindədir, çox güman ki, tezliklə həyata keçməyəcəkdir. Lakin, bununla yanaşı, mümkündür ki, yaxın onilliklərdə energetika və elektrotexnika sahəsində bəşəriyyət tərəfindən həll olunmalı olan həyati vəzifələrin həyata keçirilməsi üçün əsaslı, yeni yanaşmalar tətbiq olunacaqdır.

Hər kəs bilir ki, həyatda fərqli yaşamaq olar. Vaxtımızı əyləncə və sabah haqqında düşünmədən keçirə bilərik. Belə həyat strategiyası dəfələrlə bədii ədəbiyyatlarda da təqdim olunub. Fərqli yaşaya bilərik, bu günü tamamilə qurban verib bütün düşüncələrimizi, bütün gücümüzü qeyri – müəyyən gələcəyiniz üçün səfərbəy edə bilərik. Lakin, bütövlükdə bəşəriyyət bütövlükdə cari işlərin təlaşına qapılaraq, çox vaxt gələcək barədə düşünməməyə çalışır. Kömür, neft və təbii qazı necə asanlıqla  xərclədiyimizə baxın, özümüzü nikbinlik hissləri ilə ruhlandırırıq: "Elm adamları əmindirlər ki, yerin təkində hələ çox neft var, 30, 40 bəlkə də 50 ilə kifayyətdir”

Bu, heç də enerji təminatı baxımından bəşəriyyətin çox diqqətsiz davrandığını söyləmək deyil. Hər hansı işlər görülür, bir çox mütəxəssislər bunun kifayət olmadığını, dünya sivilizasiyasının “avtomobili” növbəti yanacaq doldurma məntəqəsinə çatmadan dayana biləcəyinə inanır. Bir çox peşəkarlar tərəfindən yeni genişmiqyaslı enerji mənbələrinin perspektivli sahələrində işlər aparılır və bəzi istiqamətlərdə praktiki nailiyyətlər əldə edilir.

Adi enerji istehlakçısı, ehtimal ki, nikbin olmaq istəyir və buna görə də bu yeni perspektivli sahələrin nə qədər inkişaf etməsi ilə ən azı maraqlanır.

Məsrəfsiz işıqdan məsrəfsiz elektrikin alınması energetikanın gələcək istiqmətlərindən biridir. Günəş enerjisinin imkanları bir rəqəmlə müəyyən edilir, təxminən 1,3 kVt / m$^2$ bərabər olan günəş sabiti ilə. Bu o deməkdir ki, Yerə yaxın bir kvadrat metrə, məsələn, bir kosmik gəmidə günəş batareyasının hər kvadrat metri üçün 1,3 kilovat günəş istilik enerjsii daxil olur. Yəni, nisbətən kiçik bir sahədən, bir kvadrat kilometr sahədən kifayyət qədər enerji əldə oluna bilər.

Yaponiya, Çin və Amerikanın bir neçə şirkətləri orbital günəş elektrik stansiyalarının yaradılmasına başladıqlarını elan ediblər.

Xüsusi çeviricilərlə hər bir stansiyanın nəhəng günəş panelləri (elan edilmiş ərazisi bir neçə kvadrat kilometrdir), günəş radiasiyasını santimetrlik radio dalğalarına çevirəcəkdir, bu da ifrat yüksək tezliki (İYT) və ya lazer şüları ilə Yerdə yerləşdirilən elektrik enerjisinin qəbuledici mərkəzi antenasına daxil olacaq və nəticədə standart dəyişən cərəyan istehsal edəcəkdir (*şəkil 6.1*). Bu cür təkliflər hələ ötən əsrin 70-ci illərində mövcud olmuşdur. Lakin, bunların heç biri iqtisadi cəhətdən səmərəli hesab olunmadığına görə tətbiq edilməmişdir.

Eyni zamanda, hesab etmək olar ki, bu gün kosmik günəş elektrik stansiyası ilə bağlı vəziyyət müsbət istiqamətdə dəyişmişdir. Çin hököməti artıq, kosmik elektrik enerjisinin alınması ilə bağlı müqavilə imzalamışdır.

Kosmik GES ilə maraqlı təkliflərdən biri ABŞ-nin Kosmik Sistemlər institutunun professoru Devid Krisvell tərəfindən təklif olunmuşdur. Onun təklifinə görə günəş stansiyasını açıq fəzada deyil Ayın səthində quraşdırmaq daha real hesab olunur. Belə ki, Ay kifayyət qədər günəş panellərinin istehsalı üçün zəruri olan xammal ilə zəngindir və yerində istehsala imkan verir. Bu layihənin dəyəri orta hesabla 60 milyard ABŞ dolları səviyyəsində qiymətləndirlir.

